# ÖYRƏN - ÖYRƏT

https://archive.org/details/@oyrenoyret2021

DİNİ VƏ ELMİ HƏQİQƏTLƏR - 5

ÖYRƏN - ÖYRƏT



*De: "Mən bunun müqabilində sizdən heç bir əvəz istəmirəm. Yalnız Rəbbinə doğru bir yol tutmaq istəyən kimsələr olmalarını istəyirəm."*
*(Furqan surəsi, 57)*

## İÇİNDƏKİ BÖLÜMLƏR:

- ⇒ Elmi Həqiqətlər
- ⇒ Qurandan Mövzular
- ⇒ İman Həqiqətləri
- ⇒ Qurandan Soruş
- ⇒ Uşaqlar Üçün
- ⇒ Müqəddəs Kitablardan Qeydlər
- ⇒ Əlavə Mövzular

oyrenoyret2021@gmail.com

## Neftin Əmələ Gəlməsi

**Xəlq edən və nizama salan, əzəldən müəyyən edən və yol göstərən, ən uca olan Rəbbinin adını pak və müqəddəs tutub şəninə təriflər de! O Rəbbin ki, yamyaşıl otlar çıxartdı. Sonra da onu quru, qara vəziyyətə döndərdi.**

(Əla surəsi, 1-5)

Məlum olduğu kimi, neft dənizlərdəki bitkilərin və heyvanların çürüməsindən sonra qalan qalıqlarından meydana gəlir. Bu qalıqlar dəniz yatağında milyonlarla il boyunca çürüyəndən sonra yerdə ancaq yağlı maddələr qalır. Palçıq və böyük qaya laylarının altında qalan yağlı maddələr də neftə və qaza dönür. Yer qabığındakı hərəkətlənmələr bəzən dənizlərin torpaq hissələri halına gəlməsinə və özündə nefti ehtiva edən qayaların minlərlə metr dərinliyə gömülməsinə səbəb olur. Meydana gələn neft də bəzən qaya təbəqələrindəki məsamələrdən sızaraq kilometrlərlə dərindən səthə çıxır və burada buxarlanaraq (qaz halına dönərək) geriyə qatran yığnağı buraxır.



"Əla" surəsinin ilk dörd ayəsində diqqəti cəlb edən üç məsələ neftin yaranma mərhələləri ilə ciddi paralellik içindədir. Xüsusilə "otlaq, düz, çəmənlik" mənalarına gələn "əlməra" ifadəsi ilə neftin yaranmasında iştirak edən üzvi mənşəli maddələrə işarə olunması ehtimalı daha çoxdur. Ayədə ikinci maraqlı söz isə qara rəngə çalan yaşıl, qaraya çalan, əsmər, his rənglərini bildirmək üçün işlədilən "əhva" kəlməsidir. Bu sözü də yerin altında yığılıb qalan bitki qalıqlarının zaman ötdükcə qara rəngli maddəyə çevrilməsi kimi qəbul etmək olar. Çünki bu kəlmələr üçüncü bir kəlmə ilə - "qusaən"lə - dəstəklənir. Bəzi Quran tərcümələrində "çör-çöp, süpürüntü" kimi məna verilən "qusaən" kəlməsi "sel suyunun otları, çöplərini bir-birinə qataraq sürüyüb gətirdiyi və dərələrin ətrafına atdığı ot, çöp, yarpaq və köpük kimi qarışıqlıq" mənasına da gəlir. "Qusmaq" mənası verən bu söz bəzi mənbələrdə "sel qusmağı" kimi tərcümə edilir və torpağın nefti qusması kimi də tərif edilir. Həmçinin neftin meydana gəlməsi, ortaya çıxması, köpüklü görünüşü, rəngi nəzərə alınanda ayələrdə işlədilən kəlmələrin nə qədər hikmətli olduğu daha yaxşı başa düşülür.

Buradan da göründüyü kimi, ayədəki bitkinin qara və axıcı bir mayeyə dönməsi neftin əmələ gəlməsi ilə çox oxşardır. Neftin əmələ gəlməsi haqqında məlumatın olmadığı bir dövrdə bu cür uzun illəri əhatə edən bir təşəkkül prosesinin tərif edilməsi, şübhəsiz ki, Quranın Allahın vəhyi olmasının başqa bir dəlilidir.

## Zamanin Nisbiliyi

Zamanın nisbiliyi mövzusu bu gün tam isbat edilmiş elmi bir həqiqətdir. Ancaq bu həqiqət XX əsrin əvvəllərində Albert Eynşteynin nisbilik ifadəsi ilə ortaya çıxıb. O dövrə qədər insanlar zamanın nisbiliyinin bir nəzəriyyə olduğunu, şəraitə görə dəyişkənlik göstərə biləcəyini bilmirdilər. Ancaq məşhur alim Albert Eynşteyn zamanın nisbiliyi nəzəriyyəsi ilə bu həqiqəti aydın şəkildə sübut etdi. Bəşər tarixi boyu heç kim bu məsələni


ALBERT EYNŞTEYN

açıq-aşkar deyə bilməmişdi. Ancaq bir istisna ilə - Quranda zamanın nisbi olduğunu göstərən məlumatlar var! Sözügedən məsələ ilə bağlı ayələri bu cür qeyd edə bilərik:

**...Rəbbinin dərgahında bir gün sizin saydıqlarınızın min ili kimidir!** (Həcc surəsi, 47)

**O, göydən yerə qədər olan bütün işləri idarə edir. Sonra** *(həmin işlər)* **sizin saydığınızın min ilinə bərabər olan bir gündə Ona yüksələr.** (Səcdə surəsi, 5)

**Mələklər və Ruh Onun dərgahına müddəti əlli min il olan bir gündə qalxarlar.** (Məaric surəsi, 70/4)

610-cu ildən etibarən göndərilməyə başlanan Quranda zamanın nisbiliyindən bu cür aydın şəkildə bəhs edilməsi onun ilahi bir kitab olduğunun başqa bir sübutudur.

## Altı Gündə Yaradılış

**Həqiqətən, Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra ərşə istiva edən Allahdır...** (Əraf surəsi, 54)

Quranla müasir elm arasındakı uyğunluğun bir nümunəsi də özünü kainatın yaşı məsələsində büruzə verir. Kosmoloqlar kainatın yaşının 16-17 milyard il olduğunu hesablayıblar. Quranda isə bütün kainatın 6 günə yaradıldığı açıqlanır. İlk baxışda fərqli kimi görünən bu zaman kəsikləri arasında çox təəccüblü bir uyğunluq var. Əslində isə, əlimizdə kainatın yaşı ilə bağlı mövcud olan bu iki rəqəmin hər ikisi də doğrudur. Yəni kainat Quranda da bildirildiyi kimi, 6 günə yaradılıb və bu dövr bizim dərk etdiyimiz zaman hesabı ilə 16-17 milyard ilə uyğun gəlir.

Eynşteyn 1915-ci ildə zamanın nisbi olduğunu, məkana, səyahət edən adamın sürətinə və həmin andakı Yerin cazibə qüvvəsinə bağlı olaraq zamanın axma əmsalının da dəyişdiyini iddia etmişdi. Zamanın axma əmsalındakı bu fərqlər nəzərə alınanda Quranda 7 fərqli ayədə bildirilən kainatın yaradılma müddətinin alimlərin təxminləri ilə üst-üstə düşdüyü görünür. Quranda bildirilən 6 günlük vaxtı 6 dövr kimi də qəbul edə bilərik. Çünki zamanın nisbiliyi nəzərə alınanda "gün" təkcə bugünkü şərtlərlə dünyada dərk edilən 24 saatlıq bir zaman kəsiyini ifadə edir. Ancaq kainatın başqa yerində, başqa vaxtda və şəraitdə "gün" daha uzun müddətlik bir zaman kəsiyidir. Həmçinin bu ayələrdə (Səcdə surəsi, 4; Furqan surəsi, 59; Hədid surəsi, 4; Qaf surəsi, 38; Əraf surəsi, 54) qeyd edilən 6 gün ("sittəti əyyamin") ifadəsindəki "əyyamin" kəlməsi "günlər" mənası ilə yanaşı, həm də "çağ, dövr, an, müddət" mənalarına gəlir.



Kainatın ilk dövrlərində zaman bu gün öyrəşdiyimiz axış sürətindən daha sürətlə axıb. Bunun səbəbi budur: "Biq bənq" ("Böyük partlayış") anında kainat çox kiçik bir nöqtəyə sıxışdırılmışdı. Bu böyük partlayış anından bu yana kainatın genişlənməsi və kainatın həcminin geriyə getməsi onun hüdudlarını milyardlarla işıq ili uzaqlığa apardı. Həmçinin "Biq bənq"dən bu günə kimi kosmosun gərilməsinin kainat saatına çox önəmli

təsirləri oldu.
"Biq bənq" anındakı enerji universal saatın zaman axış sürətini milyon dəfə milyon ($10^{12}$) dəfə yavaşıtmışdır. Kainat yaradılanda universal zamanın axış əmsalı - bu gün dərk edildiyi kimi - milyon dəfə milyon (trilyon) qat qədər daha böyük idi, yəni zaman daha sürətlə axırdı. Dolayısilə, biz Yer kürəsində milyon dəfə milyon dəqiqəni yaşadığımız əsnada universal saat üçün ancaq bir dəqiqə ötür.
Zamanın nisbiliyi nəzərə alınaraq hesablananda 6 günlük zaman kəsiyi 6 milyon dəfə milyon (trilyon) günə uyğun gəlir. Çünki universal saat Yer kürəsindəki saatın axış sürətində milyon dəfə milyon daha sürətli ötür. 6 trilyon günün əvəzi olan illərin sayı təxminən 16,427 milyarddır. Bu rəqəm günümüzdə kainatın təxmin edilən yaş aralığındadır.
6 000 000 000 000 gün / 365,25 = 16 427 104 723 il.
Digər tərəfdən, yaradılışın 6 gününün hər biri - bizim zaman idrakımızla - bir-birindən fərqli zamanlara uyğun gəlir. Bunun səbəbi zamanın axma əmsalının kainatın genişlənməsi ilə tərs mütənasib olmaqla azalmasıdır. "Biq bənq"dən etibarən kainatın böyüklüyü hər ikiyə qatlananda zamanın axma əmsalı yarıya düşüb. Kainat böyüdükcə kainatın ikiyə qatlanma sürəti də getdikcə artan tərzdə yavaşıyıb. Bu genişlənmə nisbəti "Fiziki kosmologiyanın əsasları" adlı dərs kitablarında qeyd olunan, dünyanın hər yerində geniş şəkildə yayılan və bəlli olan elmi həqiqətdir. Yaradılışın hər gününü dünya zamanı ilə hesablayanda qarşımıza aşağıdakı mənzərə çıxır:

◉ *Zamanın başladığı andan etibarən baxıldıqda, yaradılışın 1-ci günü (1-ci dövr) 24 saat davam edib. Ancaq bu müddət bizim zamanı dünyada dərk etdiyimiz şəkli ilə 8 milyard ilə bərabərdir.*

◉ *Yaradılışın 2-ci günü (2-ci dövr) 24 saat davam edib. Ancaq bu, bizim dərk etdiyimiz əvvəlki günün yarısı qədər davam edib. Yəni 4 milyard il.*

◉ *3-cü gün (3-cü dövr) isə yenə əvvəlki gün olan 2-ci günün yarısı qədər davam edib. Yəni 2 milyard il.*

◉ *4-cü gün (4-cü dövr) 1 milyard il çəkib.*

◉ *5-ci gün (5-ci dövr) 500 milyon il davam edib.*

◉ *6-cı gün (6-cı dövr) 250 milyon il davam edib.*

◉ *Nəticə: yaradılışın 6 günü, yəni 6 dövrü dünyadakı zaman növü əsasında cəmlənəndə bu zaman kəsiyi 15 milyard 750 milyon ilə bərabər olur. Bu rəqəm müasir dövrümüzdəki təxminlərlə böyük ölçüyə uyğun gəlir.*



Bu nəticə XXI əsr elminin ortaya qoyduğu həqiqətlərdir. Elm 1400 il əvvəl Quranda xəbər verilən bir həqiqəti bir daha təsdiq edir. Quran və elm arasındakı bu uyğunluq Quranın hər şeyi bilən və yaradan Allahın vəhyi olduğunun möcüzəli sübutlarından biridir.

## Alın Yazısı (Tale, Qismət, Qədər) Həqiqəti

**Allah istəməsə, siz istəyə bilməzsiniz. Həqiqətən, Allah biləndir, hökm və hikmət sahibidir!** (İnsan surəsi, 30)

ABŞ-ın Kaliforniya Universitetinin neyrofizioloqlarından olan professor Benjamin Libet 1973-cü ildə apardığı təcrübələr nəticəsində bütün qərar və seçimlərimizin əvvəlcədən müəyyənləşdirildiyini, şüurun isə hər şey baş verib qurtarandan yarım saniyə sonra hərəkətə gəldiyini ortaya qoydu. Başqa neyrofizioloqlar da bu halı həmişə keçmişdə yaşadığımız və şüurumuzun

bütün baş verənləri yarım saniyədən sonra göstərən bir monitor kimi olduğu şəklində şərh edir. (Benjamin Libet, "Unconscious cerebral initiative and the role of conscious will in voluntary action", The Behavioral and Brain Sciences, 1985, ss. 529-566.)

Dolayısılə, dərk etdiyimiz təcrübələrin heç biri həqiqi zamanda deyil, lakin gerçək hadisələrdən yarım saniyə qədər gecikir. B. Libet öz tədqiqatlarını beyin əməliyyatlarının narkoz verilməmişdən, yəni xəstənin şüuru tamamilə yerində ikən aparıla bilməsindən faydalanaraq həyata keçirmişdi. B. Libet üzərində təcrübə apardığı adamların beynini aşağı səviyyəli elektrik cərəyanı ilə xəbərdar edərək əllərinə toxunulduğu dərki meydana gətirərkən, həmin adamlar bu "toxunuşu" haradasa yarım saniyə əvvəl hiss etdiklərini söyləyirdi. B. Libet apardığı ölçmələrin köməyi ilə belə bir nəticəyə gəlmişdi: "Adi halda bütün dərklər beyinə çatdırılır. Burada şüuraltında dəyərləndirilib şərh edilərkən mən(lik) heç bir şeyin fərqində deyil. Zehnimizdə canlanan, yəni fərqinə vara bildiyimiz məlumatlar isə xeyli uzun bir gecikmədən sonra kortesə - şüurun olduğu bölgəyə göndərilir". (http://www.genetikbilimi.com/genbilim/bilincbeyninkuklasi.htm)

Ortaya çıxan nəticəni belə xülasə etmək olar: bir əzələ hərəkətini həyata keçirmək qərarı həmin qərarın şüuruna varmazdan əvvəl gerçəkləşir. Həmişə nevroloji, ya da idraki bir müddətlə bizim onu təmsil edən düşüncənin, hissin, idrakın, ya da hərəkətin şüurunda olmağımız arasında bir gecikmə var. Başqa sözlə, biz ancaq bir qərar zatən alınandan sonra həmin qərarın şüurunda ola bilərik.

Professor B. Libetin təcrübələrində bu gecikmə 350 milli saniyə ilə 500 milli saniyə arasında dəyişir, lakin ortaya çıxan nəticə bu rəqəmlərdəki dəqiqliklə bağlı deyil. Çünki B. Libetə görə, bu gecikmə olduğu müddətdə - nə qədər böyük, ya da kiçik olmasından asılı olmayaraq, bir saat, ya da mikrosaniyə olması nəzərə alınmadan - bizim maddi olan bu anı yaşamağımız həmişə keçmişdədir. Bu isə hər fikrin, hissin, idrakın, ya da hərəkətin biz bunu qavramadan əvvəl gerçəkləşdiyini göstərir ki, bu da gələcəyin tamamilə bizim nəzarətimizdən kənarda olduğunu sübut edir. (http://faculty.virginia.edu/consciousness/new_page_8.htm#5.10.%20Free%20will%20as%20the%20possibility%20of%20alternative%20action)

Professor B. Libet başqa təcrübələrində barmaqlarını nə vaxt hərəkət etdirəcəklərini seçməyi üzərində təcrübə apardığı adamların öz öhdəsinə buraxmışdı. Barmaqlarını hərəkət etdirmək anı beyinlərindən izlənən adamların bu qərarı verməzdən əvvəl əlaqəli beyin hüceyrələrinin fəaliyyətə keçdiyi görülüb. Başqa sözlə, insana "et" əmri gəlir, hərəkəti etmək üzrə beyin hazırlanır; adam isə ancaq 0,5 saniyə sonra bunun şüuruna varır. Bu, bir hərəkəti etməyə qərar verib sonra etmək deyil, özü üçün əvvəlcədən müəyyən edilən hərəkətləri etmək mənasına gəlir. Lakin beyin müəyyən bir zaman tənzimləməsi apararaq insanın, əslində, keçmişdə yaşadığı hissini aradan qaldırır. Dolayısılə, "bu an" deyəndə keçmişdə müəyyən edilmiş bir hadisəni yaşayırıq. Göründüyü kimi, bu çalışmalar "İnsan" surəsinin 30-cu ayəsində bildirildiyi kimi, hər şeyin Allahın istəməsi ilə gerçəkləşdiyini təsdiq edir.


BENJAMİN LİBET



## Fironun Azğınlığı:

**BƏQƏRƏ, 49:** İşgəncənin ən pisini sizə tətbiq edən, qadınlarınızı buraxıb oğullarınızı öldürən Fironun adamlarından sizi qurtarmışdıq. Bu, Rəbbinizdən böyük bir sınaq idi.

**YUNUS, 83:** Firon və əyanlarının işgəncə və təzyiqindən qorxduqları üçün Musaya, xalqından ancaq bir neçə nəfər iman etdi. Firon, yer üzündə həddi çox aşan bir tiran idi.



**TA-HA, 47:** "Onun yanına gedin və deyin ki 'Biz ikimiz Rəbbinin elçiləriyik. İsrail oğullarına etdiyin işgəncəyə son ver və onları bizimlə göndər. Biz sənin yanına Rəbbindən bir ayə ilə gəldik. Doğru yolu izləyənlərə salam olsun. gedənlərə salam *(sülh)* olsun!"

**QASAS, 4:** Həqiqətən, Firon yer üzündə təkəbbürlük göstərib onun əhalisini zümrələrə bölmüşdü. Firon onlardan bir zümrəni zəiflədir, onların oğlan uşaqlarını öldürür, qadınlarını isə sağ buraxırdı. Həqiqətən, o, fitnə-fəsad törədənlərdən idi.

## Kafirlər Dirildilməyəcəklərini İddia Edirlər

**ƏNAM , 29:** "Bizim üçün sadəcə dünya həyatı vardır, dirildiləcək deyilik," deyirdilər.

**HUD, 7:** O, hansınızın daha yaxşı iş görəcəyini sınamaq üçün göyləri və yeri altı gündə yaradandır. Hökmranlığı suyun üzərində idi. Buna rəğmən, kafirlərə, "Siz ölümdən sonra dirildiləcəksiniz," desən, kafirlər, "Bu, ancaq açıq-aşkar bir sehrdir *(aldadıcı bir sözdür)*," deyəcəklər.

**RƏD, 5:** Təəccüblənəcəksənsə, onların bu sözlərinə təəccüblənməlisən: "Biz torpaq olduqdan sonra yenidənmi yaradılacağıq?" Bax onlar, Rəblərini inkar edənlərdir. Onlar, boyunlarına qandallar vurulmağa layiq olanlardır. Onlar Atəşin əhlidir; həqiqətən orada əbədi qalacaqlar.

**NƏHL, 38**
"Allah ölən bir kəsi diriltməz" deyə bütün gücləriylə Allaha and içərlər. Xeyr, Onun verdiyi gerçək bir sözdür o. Ancaq insanların çoxu bunu bilmir.

**İSRA, 49:** Dedilər ki: "Sümük və xırda parçalanmış hala düşdükdən sonramı yeni bir yaradılışla dirildiləcəyik?!"

**İSRA, 50:** De ki: "İstər daş və ya dəmir olun,"

**İSRA, 51:** "Yaxud sizə görə qeyri-mümkün görünən bir formaya girin, fərq etməz." Buna qarşılıq, "Bizi kim geri döndərəcək," deyəcəklər. De ki: "Sizi ilk öncə kim yaratdısa O!" Sonra başlarını sallayıb, "Yaxşı, nə zaman?" deyəcəklər. De ki: "Bəlkə düşündüyünüzdən daha yaxın..."

**İSRA, 52:** Sizi çağıracağı gün, siz Ona təriflə qarşılıq verərsiniz və çox qısa bir müddət qaldığınızı anlayarsınız.



**İSRA, 98:** Ayələrimizi yalanladıqları, "Sümük və xırdalanmış torpaq olduqdan sonra biz yeni bir yaradılışla dirildiləcəyik?" dedikləri üçün cəzaları budur.

**NƏML, 67:** İnkar edənlər dedilər: "Biz və atalarımız torpaq olduqdan sonramı çıxardılacağıq?"

**NƏML, 68:** "Bizə və atalarımıza da daha öncə eyni söz verilmişdi. Bunlar, keçmişdəkilərin nağıllarından başqa bir şey deyildir."

**SƏCDƏ, 10:** Onlar deyirlər: "Biz torpağın içində yox olandan sonra yenidənmi

yaradılacağıq?" Doğrusu, onlar öz Rəbbi ilə qarşılaşacaqlarını inkar edirlər.

**SƏCDƏ, 11:** De: "Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaq, sonra da Rəbbinizə qaytarılacaqsınız!"

**SƏBA, 7:** Kafirlər dedilər: "Çürüyüb parça-parça olduqdan sonra yenidən yaradılacağınızı xəbər verən bir kişini sizə göstərəkmi?

**SƏBA, 8:** Əcəba, o, Allahın əleyhinə yalanmı quraşdırır, bəlkə onda divanəlik var?" Xeyr! Axirətə inanmayanlar əzaba düçar olacaq, dərin bir azğınlıq içində qalacaqlar.

**YA-SİN, 78:** O Bizə bir məsəl çəkdi, lakin yaradılışını unutdu. O dedi: "Çürümüş sümükləri kim dirildə bilər?"

**YA-SİN, 79:** De: "Onları ilk dəfə yaradan Özü onları diriIdəcəkdir. O, hər bir məxluquna yaxşı bələddir.

**SAFFAT, 16:** Məgər biz öldükdən, sür-sümük olub torpağa çevrildikdən sonra dirildiləcəyikmi?

**SAFFAT, 17:** Ya da atalarımızmı dirildiləcəklər?"

**SAFFAT, 18:** De: "Bəli, özü də, zəlil günə qalmış olduğunuz halda dirildiləcəksiniz".

**SAFFAT, 19:** Bu, təkcə dəhşətli bir səs olacaq və onlar qəfildən dirilib görməyə başlayacaqlar.

## Əvvəlki Cəmiyyətlər:

**TÖVBƏ, 70:** Nuhun xalqı, Ad, Səmud, İbrahim xalqı, Mədyən sakinləri və alt-üst olmuş ölkələrin *(Sodom ve Gomorra)* xalqları kimi özlərindən öncəkilərin xəbərləri onlara yetişmədimi? Elçiləri onlara açıq-aşkar dəlillərlə getmişdilər. Allah onlara zülm etmirdi, əksinə onlar öz-özlərinə zülm edirdilər.

**HƏCC, 42:** Səni yalanlayarlarsa, onlardan öncə Nuh, Ad və Səmud xalqları da yalanlamışdılar.

**HƏCC, 43:** İbrahimin xalqı, Lutun xalqı da...

**HƏCC, 44:** Mədyən yerliləri də... Musa belə yalanlandı. Mən o kafirlərə möhlət verdim və sonra onları hesaba çəkdim;



Məni tanımamaq da necə imiş...

**SAD, 12:** Onlardan əvvəl Nuh qövmü, Ad və dirəklər sahibi Firon da elçiləri yalançı saymışdılar.

**SAD, 13:** Həmçinin Səmud, Lut qövmü və Əykə əhli də. Bunlar əlbir dəstələr idi.

**QAF, 12:** Onlardan əvvəl Nuh qövmü, Rəss əhli, Səmud tayfası elçiləri yalançı saydı.

**QAF, 13:** Ad qövmü, Firon xalqı, Lut tayfası,

**QAF, 14:** Əykə əhli və Tubba qövmü – bunların hamısı elçiləri yalançı saydı və Mənim təhdidim gerçəkləşdi.

## İsrail Oğullarına Göstərməsi Üçün Musaya Verilən Möcüzələr:

**BƏQƏRƏ, 55:** O zaman siz: "Ey Musa! Biz Allahı açıq-aşkar görməyincə sənə iman gətirməyəcəyik!"– dediniz və gözünüz görə-görə sizi ildırım vurdu.

**BƏQƏRƏ, 56:** Ölümünüzdən sonra Biz sizi diriltdik ki, bəlkə şükür edəsiniz.



**BƏQƏRƏ, 73:** Biz dedik: "*(Düyənin)* bir parçasıyla ona *(öldürülənə)* vurun!" Bax, Allah ölüləri bu cür diriIdir və düşünəsiniz deyə ayələrini *(möcüzələrini)* bu cür göstərir.

**ƏRAF, 117:** Biz də Musaya "Əsanı at," deyə vəhy etdik. Necə ki, o, onların uydurduqlarını toplayıb uddu.

**ƏRAF, 160:** Onları on iki qəbilə halında topluluqlara ayırdıq. Xalqı ondan su

istədiyi zaman Musaya, "Əsan ilə daa vur," deyə vəhy etdik. Ondan on iki çeşmə fışqırdı və hər qəbilə içəcəyi yeri bildi. Ayrıca onları buludlarla kölgələndirdik və üzərlərinə mənna və bildirçin endirdik: "Sizə verdiyim ruzilərdən yeyin." Onlar Bizə haqsızlıq etmirdilər, öz-özlərinə haqsızlıq edirdilər.

**ƏRAF, 171:** Dağı bir çətir kimi üzərlərində sallamışdıq. Belə ki, təpələrinə düşəcəyini sanmışdılar: "Sizə verdiyimə möhkəmcə sarılın. Qurtula bilməniz üçün məzmunu üzərində düşünün."

**ŞUƏRA, 63:** Musaya, "Dəyənəyini dənizə vur!" deyə vəhy etdik. Bundan sonra yarıldı, hər hissəsi böyük bir təpə kimi oldu.

**QASAS, 30:** Musa oraya gəlib çatdıqda sağ tərəfindəki vadinin yaxınlığında olan mübarək yerdəki ağac tərəfdən ona nida gəldi: "Ey Musa! Aləmlərin Rəbbi olan Allah Mənəm!

**QASAS, 31:** Əsanı yerə at!" Musa onun ilan kimi qıvrıldığını görüb, geriyə belə baxmadan dönüb qaçmağa başladı. Allah dedi: "Ey Musa! Yaxın gəl, qorxma! Sən əmin-amanlıqda olanlardansan!

**QASAS, 32:** Əlini qoynuna sal ki, əlin oradan ləkəsiz, ağappaq çıxsın. Qorxu keçib getsin deyə əlini özünə sıx. Bu, Firona və onun əyanlarına qarşı sənin Rəbbindən olan iki tutarlı dəlildir. Həqiqətən, onlar fasiq adamlardır".

## Rəbbimiz Verdikləri ilə Sınamaq Üçün, Bizi Bir-Birimizə Dərəcələrlə Üstün Edər:

**ƏNAM, 165:** O ki sizi yer üzünün mirasçıları etdi, və sizə verdikləriylə sizi sınamaq üçün kiminizi kiminizə dərəcələrlə üstün etdi. Rəbbin tez nəticələndirəndir. Bağışlayandır, Rəhmlidir.

**NƏHL, 71:** Allah ruzi *(mal, imkan)* baxımından sizi bir-birinizdən üstün etmişdir. Halbuki üstünlük verilənlər, əmrləri altındakılarla imkanlarını eyni bölüşməzlər. Allahın nemətinimi rədd edirlər?

**İSRA, 21:** İnsanları bir-birindən necə üstün etdiyimizə diqqət et. Axirətin dərəcələri və üstünlükləri daha böyükdür.

**ZUXRUF, 32:** Sənin Rəbbinin mərhəmətini onlarmı bölüşdürürlər? Biz dünya həyatında onların dolanışıqlarını aralarında bölüşdürdük. Biri digərini öz yanına işçi götürsün deyə, bəzilərinin dərəcələrini digərlərindən üstün etdik. Sənin Rəbbinin mərhəməti onların yığdıqlarından daha xeyirlidir.

## Heç Kimsə Başqa Bir Kimsənin Yükünü Daşımaz (Yüklənməz):

**NİSA, 111:** Kim günah qazanarsa, onu ancaq özünün əleyhinə qazanmış olar. Allah Biləndir, Müdrikdir.

**İSRA, 15:** Kim doğru yola gəlirsə, özü üçün yola gəlmiş olur. Kim azarsa, öz əleyhinə azar. Heç kimsə başqasının yükünü çəkməz. Biz bir elçi göndərmədən heç kimsəni cəzalandırmarıq.

**FATİR, 18:** Heç bir günahkar başqasının günah yükünü daşımaz. Yükü ağır olan kimsə öz yükünü daşımaq üçün başqasını köməyə çağırsa və çağırdığı kimsə yaxın qohumu olsa belə, o yükdən heç nə daşınmaz. Sən ancaq Rəbbindən Onu görmədikləri halda qorxanları və namaz qılanları xəbərdar edirsən. Kim günahlardan təmizlənirsə, öz xeyrinə təmizlənmiş olur. Qayıdış də ancaq Allahadır.

**ZUMƏR, 7:** Küfr etsəniz, bilin ki, Allah sizə möhtac deyildir. O, qullarının kafirlik etməsinə razı olmaz. Əgər şükür etsəniz, buna görə sizdən razı qalar. Heç bir günahkar başqasının günah yükünü daşımaz. Sonra Rəbbinizin yanına qayıdacaqsınız. O sizə nə etdiklərinizi bildirəcəkdir. Həqiqətən, O, köksləndə olanları bilir.

**NƏCM, 38:** Heç bir günahkar başqasının günah yükünü daşımaz.

**MUDDƏSSİR, 38:** Hər bir kəs qazandığının girovuna çevrilir.

## Başqalarının Günah Yükü ilə Yüklənərlər: (Əlaqəli)

**NİSA, 85:** Kim bir yaxşılığa vasitəçilik edərsə, özü üçün ondan bir pay var. Kim bir pisliyə vasitəçilik edərsə, özü üçün ondan bir pay var. Allah hər şeyə nəzarət edir.

**NƏHL, 25:** Dirilmə günündə öz günahlarının hamısını, ayrıca azdırdıqları kimsələrin günah yüklərindən də bir payı yüklənərlər. Yükləri necə də pisdir.

**ƏNKƏBUT, 11:** Allah iman gətirənləri də, münafiqləri də aşkar edəcəkdir.

**ƏNKƏBUT, 12:** Kafirlər möminlərə: "Bizim yolumuzla gedin, günahlarınızı öz üstümüzə götürək"– deyirlər. Halbuki onların heç biri heç kimin günahının altına girən deyildir. Şübhəsiz ki, onlar yalançıdırlar.

**ƏNKƏBUT, 13:** Onlar həm öz günah yüklərini və həm də onlarla yanaşı, neçə-neçə yükləri də daşıyacaqlar. Qiyamət günü onlar uydurduqları şeylər barəsində mütləq sorğu-suala çəkiləcəklər.

## Dirilmə Günü Allaha Andları:

**ƏNAM, 22:** Hamısını topladığımız gün ortaq qoşanlara, "Haradadır iddia etdiyiniz ortaqlarınız?"

**ƏNAM, 23:** Onların tək müdafiəsi bu olacaq: "Rəbbimiz Allaha and olsun ki, biz ortaq qoşmadıq."

**NƏHL, 28:** Onlar ki, nəfslərinə zülm edərkən mələklər canlarını alır. Axırda təslim olub: "Biz hər hansısa bir pislik etmirdik!" deyərlər. Xeyr, Allah sizin etdiklərinizi yaxşı bilir.

**MUNAFİQUN, 1:** Münafiqlər sənin yanına gəldikləri zaman: "Biz şəhadət veririk ki, sən Allahın Elçisisən!"– deyirlər. Allah da bilir ki, sən Onun Elçisisən. Allah şahiddir ki, münafiqlər əsl yalançıdırlar.

**MUNAFİQUN, 2:** Onlar andlarını sipər edib insanları Allah yolundan döndərdilər. Həqiqətən, onların törətdikləri əməllər necə də pisdir!

## Rəbbimizə Şükür Etməmiz Üçün Bəzi Səbəblər:

**BƏQƏRƏ, 172:** Ey iman gətirənlər! Sizə verdiyimiz ruzilərin yaxşılarından yeyin. Allaha şükür edin, sadəcə Ona qulluq/ xidmət edirsinizsə.

**ƏRAF, 10:** Sizləri yer üzünə yerləşdirdik və orada sizləri yaşama imkanları ilə təmin etdik. Nə qədər də az şükür edirsiniz.

**ƏRAF, 189:** O Sizi tək bir nəfsdən *(eyni genetik xüsusiyyətdən)* yaratdı. Ondan da zövcəsini yaratdı ki, sükunət tapsın. Zövcəsinə yaxınlaşınca, yüngül bir yüklə yükləndi və onunla dolaşdı. Yükü ağırlaşınca hər ikisi Rəbləri Allaha: "Bizə qüsursuz bir övlad verərsən şükür edənlərdən olacağıq," deyə yalvardılar.

**NƏHL, 14:** O ki, dənizi əmrinizə sunmuşdur; ondan təzə ət yeyirsiniz, ondan geyim və zinət üçün süslər çıxarırsınız. Gəmilərin dənizi yara-yara axıb getdiyini görürsünüz. Beləcə Onun lütfünü axtararsınız və bəlkə Ona şükür edərsiniz.

**ƏNBİYA, 80:** Və sizi savaşlarınızda qorusun deyə ona zireh düzəltməyi öyrətdik. Artıq şükür edərsinizmi?

**QASAS, 72:** De: "Bir deyin görək, əgər Allah gündüzü üstünüzdə qiyamətə qədər uzatsa, Allahdan başqa hansı məbud dincəldiyiniz gecəni sizə gətirə bilər? Məgər siz görmürsünüz?"

**RUM, 46:** Sizə Öz mərhəmətindən daddırsın, əmri ilə gəmilər üzsün, Onun lütfünü arayasınız və sizə verdiyi nemətlərə şükür edəsiniz deyə küləkləri müjdəçi göndərməsi də Onun dəlillərindəndir.

**ŞURA, 33:** Əgər Allah istəsə, küləyi sakitləşdirər, onlar da suyun üzündə hərəkətsiz qalarlar. Həqiqətən, bunda səbirli olan və şükür edən hər bir kəs üçün ibrətlər vardır.

**MULK, 23:** De: "Sizi yaradan, sizə qulaq, göz və ürək verən Odur. Necə də az şükür edirsiniz!"

# Ağcaqanad

Quranda Allah insanları, təbiəti araşdırmağa və burada yaradılmış olan "ayələri" görməyə çağırır. Çünki kainatdakı canlı-cansız bütün varlıqlar, "yaradılmış" olduqlarını göstərən işarələrlə doludur və özlərini Yaradanın güc, elm və sənətini göstərmək üçün vardırlar. İnsan, ağlını istifadə edərək bu işarələri görmək və Allahı tanımaqla məsuldur. Quranda ayrıca Allahın xüsusi olaraq diqqət çəkdiyi bəzi canlılar da vardır. Ağcaqanad, bunlardan biridir. Bəqərə surəsinin 26-cı ayəsində ağcaqanaddan Allah belə bəhs edir:

**Həqiqətən, Allah ağcaqanadı və** *(istər böyüklükdə, istərsə də kiçiklikdə)* **ondan da üstün olanı məsəl çəkməkdən utanmaz. İman gətirənlər bilirlər ki, bu, onların Rəbbindən gələn haqdır. Küfr edənlər isə deyirlər: "Bu məsəllə Allah nə demək istədi?" Halbuki O bununla bir çoxlarını azdırır və bir çoxlarını da haqq yoluna yönəldir. Lakin O, bununla yalnız fasiqləri yoldan çıxarır.** (Bəqərə surəsi, 26)



Dəyərsiz və adi bir canlı kimi görünən ağcaqanad belə əslində Allahın ayələrini üzərində daşıması baxımından diqqət edilməli, araşdırılmalı, üzərində düşünülməli olan bir heyvandır. Məhz bu səbəblə də, Allah **"ağcaqanadı və ondan da üstün olanı məsəl çəkməkdən utanmaz."**

# Ağcaqanadın Fövqəladə Sərgüzəştləri



Ağcaqanadlarla əlaqədar olaraq ümumiyyətlə məlum olan, onların qansoran varlıqlar olduqları və qanla qidalandıqlarıdır. Halbuki, bu tam olaraq doğru bir məlumat deyil. Çünki ağcaqanadların hamısı deyil, yalnız dişiləri qan sorar. Ayrıca, dişilərin qan sorma səbəbləri qidalanma ehtiyacları üçün deyil. Həm dişi, həm də erkəklərin qidaları çiçək tozlarıdır. Dişilərin erkəklərdən fərqli olaraq qan sormalarının tək səbəbi, daşıdıqları yumurtaların yetkinləşmək üçün qanda olan zülallara ehtiyac duymalarıdır. Başqa bir sözlə, dişi ağcaqanad yalnız növünün davamını təmin etmək üçün qan sorar.

Buradakı əhəmiyyətli nöqtə isə, Allahın ayədə "dişi ağcaqanadlara" diqqət çəkməsidir. Daha əvvəl də ifadə etdiyimiz kimi qan soran və erkəyə görə daha üstün xüsusiyyətlərə sahib olanlar, yalnız dişi ağcaqanadlardır. Quranın endirildiyi dövrdə bu əhəmiyyətli incəliyin bilinməməsinə baxmayaraq, Allahın ayədə xüsusilə "dişi" ağcaqanada diqqət çəkməsi əlbəttə, olduqca mənalıdır.

Ağcaqanadın ən fövqəladə və heyranlıq oyandırıcı xüsusiyyətlərindən biri inkişaf müddətidir. Bir canlının kiçik bir qurddan çox fərqli mərhələlər keçirərək ağcaqanada çevrilməsinin qısa tarixi belədir:

Qanla bəslənən və yetkinləşən ağcaqanad yumurtaları, yaz ya da payız aylarında, nəmli yarpaqların üzərinə və ya qurumuş gölməçələrə dişi ağcaqanad tərəfindən

buraxılarlar. Ana ağcaqanad əvvəlcə qarnının altındakı həssas qəbuledicilərin köməyiylə torpaqda yumurtalar üçün uyğun şərtlər axtarar. Lazım olan xüsusiyyətlərə sahib bir yer tapdığında yumurtlamağa başlayar. Uzunluqları 1 millimetrə də çatmayan yumurtalar tək-tək ya da qruplar halında olmaqla sırayla düzülər. Bəzi növlər isə yumurtalarını bir sal meydana gətirərcəsinə bir-birinə yapışmış şəkildə buraxarlar. Bu yumurta qruplarının bəzilərində 300-ə qədər yumurta olar.



Ana ağcaqanadın diqqətlə yerləşdirdiyi ağ rəngli yumurtalar dərhal tündləşməyə başlayar və iki saat içində tamamilə qapqara olarlar. Bu tünd rəng, böcəklərin və quşların fərq etmələrinə maneə törətdiyindən yumurtalar üçün əhəmiyyətli bir qoruma təmin edər.



Yumurtalardan başqa bəzi sürfələr də olduqları məkana görə rəng dəyişməsinə uğrayarlar və bunun sayəsində qorunarlar. Müxtəlif amillərdən faydalanaraq rəng dəyişdirmək olduqca kompleks kimyəvi proseslərin nəticəsində baş verər. Əlbəttə ki, ağcaqanadların müxtəlif mərhələlərindəki rəng dəyişikliyindən nə yumurtaların, nə sürfələrin, nə də ana ağcaqanadın xəbəri yoxdur. Bu canlıların belə bir sistemi özlərinin meydana gətirməsi, ya da bu sistemin təsadüfən ortaya çıxmış olması da mümkün deyil. Ağcaqanadlar ilk ortaya çıxdıqları andan etibarən bu sistemlərlə birlikdə yaradılmışlar.

## Yumurtadan Çıxış

Kürt dövrü tamamlandığında sürfələr demək olar ki, eyni zamanda yumurtadan çıxmağa başlayarlar. Aralıqsız bir şəkildə bəslənən sürfələr sürətlə böyüyərlər. Qısa zaman içində dəriləri daha çox böyüməılərinə maneə törədəcək qədər gərginləşər. Bu, ilk dəri dəyişməsi zamanının gəldiyinin göstəricisidir. Bu mərhələdə, olduqca sərt və kövrək olan dəri asanca qırılar. Ağcaqanad qurdcuğu inkişafını tamamlayana qədər iki dəfə də dəri dəyişdirəcək.

Sürfələrin bəslənməsi üçün yaradılmış olan üsul olduqca maraqlıdır. Sürfələr, tüklərdən yaranan yelpik formasındakı iki bığcıqla su içində kiçik burulğanlar meydana gətirərək, bakteriya və digər mikroorqanizmlərin ağızlarına doğru axmalarını təmin edərlər. Su içində başıaşağı dayanan sürfələrin tənəffüsü isə dalğıcların istifadə etdiyi "hava borusu" kimi bir hava xortumuyla təmin edilər. Bədənlərinin ifraz etdiyi yapışqan bir ifrazat da, suyun hava dəliklərindən içəri girməsinə maneə olar. Görüldüyü kimi bu canlı, bir çox həssas tarazlığın bir yerdə fəaliyyət göstərməsi sayəsində yaşayır. Hava xortumu olmasa ağcaqanad qurdcuğu yaşaya bilməyəcək, yapışqan ifrazat olmasa xortum suyla dolacaqdır. Bu iki sistemin bir-birindən fərqli zamanlarda meydana gəlməsi ağcaqanadın bu mərhələdə ölməsi deməkdir. Bu da ağcaqanadın bütün sistemləriylə əskiksiz olaraq ortaya çıxdığını, yəni yaradıldığını sübut edər.

Sürfələr dərilərini bir dəfə də dəyişdirmişlər. Son dəri dəyişdirmə digərlərindən olduqca fərqlidir. Bu mərhələdə sürfələr artıq həqiqi ağcaqanad




olmaq üçün son mərhələ olan "pup" dövrünə girmişlər. İçində olduqları örtük yaxşı şəkildə gərginləşmişdir. Bu da pupun artıq bu örtükdən xilas olma zamanının gəldiyini göstərir. Örtüyün içindən elə fərqli canlı çıxar ki, bunların eyni canlının fərqli inkişaf mərhələləri olduğuna inanmaq həqiqətən çətindir. Göründüyü kimi bu dəyişmə, nə qurdcuğun, nə anasının, nə də bir başqa canlının hazırlaya bilməyəcəyi qədər mürəkkəb və həssas bir əməliyyatdır.

Bu son dəyişmə əsnasında bir boru vasitəsilə suyun üstünə uzanmış olan tənəffüs dəlikləri bağlanacağından, canlı havasız qalma təhlükəsiylə üz-üzə gələr. Amma yeni çıxan canlının tənəffüsü artıq bu kanaldan deyil, baş tərəfində meydana gələn iki boru vasitəsilə ediləcək. Buna görə örtük dəyişdirməyə başlamazdan əvvəl bunlar su üzünə çıxar. Pup baramasının içindəki ağcaqanad artıq yaxşı şəkildə inkişaf etmişdir. Bir antena formasındakı bığcıqları, xortumları, ayaqları, sinəsi, qanadları, qarnı və başının böyük hissəsini örtən gözləri ilə ağcaqanad artıq uçmağa hazırdır. Pupun baraması baş tərəfdən cırılar. Bu mərhələdəki ən böyük təhlükə baramanın içinə su girməsidir. Ancaq cırılan baramanın baş tərəfi, ağcaqanadın başının su ilə təmasına maneə törədəcək bir yapışqan mayeylə örtülmüşdür. Bu an çox əhəmiyyətlidir, ən kiçik bir külək belə suya düşüb ölməsinə yol açacağı üçün ağcaqanad suya yalnız ayaqları dəyərək çıxmaq məcburiyyətindədir. Bunu bacarar.



Görəsən, ilk ağcaqanad belə bir çevriliş edəcək "qabiliyyətə" necə nail olmuşdur? Bir qurdcuq, öz-özünə, üç dəfə dəri dəyişdirib bir ağcaqanada çevrilməyə "qərar" mı vermişdir?

Əlbəttə xeyr, aydındır ki, Allah nümunə olaraq verdiyi bu canlını xüsusi olaraq bu şəkildə yaratmışdır.

## Ağlasığmaz "Qan Sorma" Texnikası

Ağcaqanadın "qan sorma" texnikası isə insanları çox təəccübləndirəcək qədər təfərrüatlı quruluşların birlikdə fəaliyyəti ilə meydana gələn mürəkkəb bir sistemə bağlıdır.

Hədəf üzərinə qonan ağcaqanad, xortumundakı dodaqcıqlar vasitəsilə

əvvəl bir nöqtə seçər. Ağcaqanadın şprisə bənzəyən iynəsi xüsusi bir örtüklə qorunmuşdur. Qan sorma əməliyyatı əsnasında bu örtük iynədən sıyrılar.




Dəri, sanıldığı kimi iynənin batırılması üsuluyla deşilməz. Buradakı əsas vəzifə bıçaq itiliyindəki üst çənə və üzərində geriyə doğru meyilli dişlərin olduğu alt çənəyə düşür. Alt çənə mişar kimi irəli-geri hərəkət edər və dəri üst çənənin köməyiylə sanki kəsilər. Açılan yarıqdan içəri girən iynə qan damarına çatınca deşmə əməliyyatına son verilər. Ağcaqanad artıq qan sormağa başlayacaq.
Ancaq bilindiyi kimi insan bədəni, damarlardakı ən kiçik bir zədələnmə qarşısında qanı anında laxtalanaraq, o bölgədəki qan axışını dayandıran bir fermentə malikdir. Əslində, bunun ağcaqanad üçün böyük bir problem yaratması lazımdır. Çünki onun açdığı kiçik dəliyə də bədən anında reaksiya verəcək, dərhal qan laxtalanacaq və təmir prosesi başlayacaq. Təbii, bu da ağcaqanadın heç qan sora bilməməsi deməkdir.
Amma ağcaqanad üçün bu problem tamamilə ortadan qaldırılmışdır. Ağcaqanad qan sormağa başlamazdan əvvəl, bədənində ifraz etdiyi xüsusi bir mayeni insan damarında açdığı dəliyin içinə buraxır. Bu maye, qandakı laxtalanmanı həyata keçirən fermenti təsirsiz hala gətirər. Beləcə, laxtalanma problemi olmadan, ağcaqanad qidasına çata bilər. Ağcaqanadın sancdığı yerdəki qaşınmaya və şişməyə səbəb olan da bu laxtalanmanı əngəlləyən mayedir.
Bu, şübhəsiz fövqəladə bir əməliyyatdır və qarşımıza bu sualları çıxarar:
1) Ağcaqanad insan bədənində bu cür bir laxtalandırıcı ferment olduğunu haradan bilir?
2) Bu fermentə qarşı öz bədənində bir ifrazat inkişaf etdirməsi üçün, fermentin tərkibini bilmək məcburiyyətindədir. Bu necə ola bilər?
3) Belə bir məlumatı əldə etsə belə, necə olub da öz bədənindən belə bir ifrazat çıxarıb, bunu iynəsinə köçürəcək "texniki təchizat"ı meydana gətirə bilər?
Əslində bütün bu sualların cavabı sadədir: Ağcaqanad bunların heç birini bacara bilməz. Nə bunun üçün lazımlı ağıla, nə kimya elminə, nə də ifrazatı çıxaracaq "laboratoriya" təchizatına malikdir. Bəhs etdiyimiz varlıq, bir neçə millimetr böyüklüyündə heç bir şüuru olmayan bir ağcaqanaddır, bu qədər!...
Ağcaqanadı belə inanılmaz, fövqəladə və heyranedici bir sistemə sahib edən isə, "göylərin, yerin və hər ikisi arasındakıların Rəbbi olan" Allahdır.

## AĞCAQANAD ƏTRAFINDAKİ CANLILARI BELƏ QAVRAYIR

**Ağcaqanadlar son dərəcə həssas istilik sensorlarına malikdirlər. Onlar aşağıdakı şəkildəki kimi ətraflarındakı varlıqları temperaturlarına görə rəngarəng qavrayırlar.**
**Bu qavrayış işığa bağlı olmadığı üçün qaranlıq otaqda belə qan damarlarını asanlıqla tapa bilirlər.**
**Ağcaqanad istilik sensorları 1/1000 dərəcə temperatur dəyişikliklərini aşkar etmək üçün kifayət qədər həssasdır.**



# Allaha Necə Tay Tutdular?

**ƏNAM, 40:** De: "Doğrusunuzsa söyləyin görüm, sizə Allahın əzabı, yaxud Saat *(dünyanın sonu)* gəlsə, Allahdan başqasınamı yalvararsınız?"

**ƏNAM, 41:** Doğrusu, Yalnız Ona yalvararsınız. İstəyərsə yalvardığınız mövzudakı probleminizi aradan qaldırar, siz də ortaq qoşduqlarınızı unudarsınız.

**ƏNAM, 94:** "Sizi ilk dəfə yaratdığımız kimi Bizə tək olaraq gəldiniz. Sizə xəyal kimi göstərdiyimiz şeyləri ardınızda buraxdınız. Haqqınızda *(veriləcək qərarda Tanrı ilə)* ortaq davranacaqlarını irəli sürdüyünüz şəfaətçilərinizi yanınızda görmürük. Aranızdakı bağlar kəsilmişdir. İrəli sürdükləriniz sizi tərk etmişdir."



**ƏNAM, 136:** Allahın yaratdığı əkinlərdən və mal-qaralardan Ona bir pay ayıraraq, *(öz)* başlarına görə, "Bu Allahın, bu da ortaqlarımızındır," dedilər. Ortaqlarının payı Allaha yetişmir; ancaq Allahın payı ortaqlarına yetişir! Necə də pis hökm verirlər.

**ƏNAM, 137:** Beləcə, onların *(Tanrı adından hökm verən)* ortaqları, övladlarını öldürməyi belə müşriklərin *(ortaq qoşanların)* çoxuna yaxşı bir şeymiş kimi göstərdilər. Beləcə onları məhv etdilər və dinlərini qarışdırıb pozdular. Allah istəsəydi bunu edə bilməzdilər. Onlardan və uydurduqları şeylərdən uzaq dur.

**YUNUS, 18:** Allahı buraxıb, özlərinə nə zərər, nə də fayda verə bilməyənlərə ibadət edirlər və: "Bunlar, Allah yanında bizə şəfaət edəcəklər," deyirlər. De ki: "Allahın göylərdə və yerdə bilmədiyi şeylərimi Ona bildirirsiniz? O çox Ucadır, ortaq qoşduqlarınızdan uzaqdır."



**YUNUS, 66:** Göylərdə və yerdə nə varsa Allahındır. Allahdan başqalarına yalvaranlar əslində qoşduqları ortaqları izləməməkdədirlər. Onlar sadəcə təxmin irəli sürürlər və sadəcə cəfəngiyyat danışırlar.

**YUNUS, 105:** Və: "Monoteist *(Təkallahlı)* olaraq dinə yönəl; ortaq qoşanlardan olma."

**YUNUS, 106:** "Allahı buraxıb, sənə fayda və zərər verə bilməyənləri çağırma. Belə etsən o zama zalımlardan olarsan."

**İBRAHİM, 30:** Allahın yolundan azdırmaq üçün Ona ortaqlar qoşdular. De ki: "Bir az əylənin, son yolçuluğunuz atəşə olacaqdır."

**NƏHL, 35:** Ortaq qoşanlar, "Allah istəməsəydi, nə biz, nə də atalarımız Ondan başqa bir şeyə ibadət etməz və Onun haram etdiyindən başqasını da haram etməzdik" *(deyirlər.)* Onlardan öncəkilər də bu cür davranmışdı. Elçinin açıq şəkildə bildirməkdən başqa bir görəvimi var?

**NAHL, 86:** Ortaq qoşanlar, ortaq qoşduqları kimsələri gördükləri zaman, "Rəbbimiz, Səndən başqa çağırdığımız ortaqlarımız bax bunlardır," deyərlər. *(Onlar da)*, "Siz yalançılarsınız *(biz sizin bu günahınıza heç bir zaman ortaq olmadıq)*," deyə qarşılıq verərlər.



*"O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)*

**Çünki Rəbbin sözü haqdır, Hər işini sədaqətlə aparır. Rəbb salehliyi və ədaləti sevir, Yer üzü Onun məhəbbəti ilə dolur.** Göylər Rəbbin sözü ilə... yarandı. Dənizin sularını bir yerə yığdı, Dərin suları anbarlarda saxladı. Qoy bütün dünya Rəbdən qorxsun, Bütün yer üzünün əhalisi Onu şərəfləndirsin. **Çünki nə söylədi, mövcud oldu, Nə əmr etdi, quruldu.** Rəbb millətlərin məsləhətini puç edər, Xalqların məqsədini heç edər. Lakin Rəbbin məsləhəti əbədi olar, Ürəyinin məqsədi nəsillər ötsə də, qalar. **Nə bəxtiyardır o millət ki Allahı Rəbdir, O xalq ki Rəbb onu irs olaraq seçmişdir. Rəbb göylərdən baxır, Bütün bəşər övladlarını görür, Odur hər bir insanın ürəyini yaradan, Əməllərini anlayan.** Qoşunun çoxluğu ilə heç bir padşah qurtulmaz, Qolunun gücü ilə heç bir cəngavər zəfər çalmaz. Qələbə üçün at boş şeydir, Qüvvətinin çoxluğu ilə bir kimsə xilas olmaz. Rəbbin gözü Ondan qorxanlara, Onun məhəbbətinə ümid bağlayanlara baxar. İstəyir ki, onları ölümdən qurtarsın, Qıtlıqda belə, onlar sağ qalsın. **Könlümüz Rəbbin yolunu gözlər, Odur köməyimiz və sipərimiz. Bizim qəlbimiz Onda sevinc tapır, Müqəddəs isminə arxalanmışıq**. Ya Rəbb, ümidimizi Sənə bağlamışıq, Məhəbbətin üzərimizdən tükənməsin. (Zəbur, 33:4-22)

Allah mənim sipərimdir, Ürəyidüz olanları xilas edir. (Zəbur 7:10)

Arxayın yatıb yuxuya gedirəm, Çünki **yalnız Sən, ya Rəbb, məni əmin-amanlıqda yaşadırsan!** (Zəbur, 4:8)

## Allah Sevdiyi Qullarını Günahlardan Təmizləyər

Təqsirimi tamamilə yu, Günahımdan məni təmizlə (Zəbur, 51:2)

**...Ürəyini pislikdən yuyub-təmizlə ki, xilas olasan**. Bəd fikirlərin nə vaxta qədər içində qalacaq? (Yeremya, 4:14)

Yaqub ailəsinə və onunla olanların hamısına dedi: "Yanınızda olan özgə büt allahlarını atın" və **özünüzü pak edib paltarlarınızı dəyişin**. (Yaradılış, 35:2)

Artıq bütləri, iyrənc şeyləri və üsyanları ilə özlərini murdar etməyəcəklər. **Onları yaşadıqları və içində günah etdikləri yerlərdən qurtarıb pak edəcəyəm...** (Yezekel, 37:23)

Çoxları paklanıb ləkəsiz və təmiz olacaq, pis adamlar isə şər işlərindən dönməyəcək. Pis adamlardan heç biri bu sözləri başa düşməyəcək, ağıllı adamlar isə başa düşəcək. (Daniel, 12:10)

Əlləri pak, qəlbi təmiz, Hiyləyə könül verməyən, Yalandan and içməyən insan. O, **Rəbdən bərəkət alacaq, Xilaskarı Allahdan salehlik alacaq**. Belə adam Rəbbi soraqlayar, Yaqubun Allahının üzünü axtarar. Sela (Zəbur, 24:4-6)

Bununla Harun İsrail övladlarının murdarlığına, qanunsuzluğuna və bütün günahlarına görə Müqəddəs yer üçün kəffarə etsin; murdar xalqın arasında yerləşdiyinə görə Hüzur çadırı üçün belə



***“O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar.” (Bəqərə surəsi, 4)***

etsin. (Levililər, 16:16)

...Götür və onları pak et. (Saylar, 8:6)

Ey Allah, bizi sınaqdan keçirtdin, Sən bizi gümüş kimi təmizləyib saflaşdırdın. (Zəbur, 66:10)

Qızıl-gümüş isti kürədə yoxlanar, **Rəbb isə ürəyi araşdırar**. (Süleymanın Məsəlləri, 17:3)

Üstünüzə təmiz su səpəcəyəm, pak olacaqsınız. Sizi bütün murdarlıqlarınızdan və bütlərinizdən təmizləyəcəyəm. (Yezekel, 36:25)

**Xudavənd Rəbb belə deyir: Sizi bütün təqsirlərinizdən təmizlədiyim vaxt** şəhərləri məskunlaşdıracaq, xaraba yerləri abad edəcəyəm. (Yezekel, 36:33)

Ağıllı adamlardan bəzisi həlak olacaq ki, qalanları **axır zamana qədər paklanıb təmizlənsin və ləkəsiz olsun.** Çünki axır zaman yenə də müəyyən vaxtda olacaq. (Daniel, 11:35)

...Günahdan və murdarlıqdan təmizləmək üçün bir bulaq açılacaq. (Zəkəriyyə, 13:1)

Oğlum, Rəbbin verdiyi tərbiyəyə xor baxma, Onun məzəmmətinə nifrət etmə. Ata sevdiyi oğlunu necə məzəmmət edərsə, Rəbb də sevdiyini elə məzəmmət edər. (Süleymanın Məsəlləri, 3:11-12)

## Yaxşılıq Edənlər Allahın Sevgisini Qazanar

Şər quranlar yolundan azmırlarmı? **Məqsədi xeyirxahlıq olan xeyirxahlığa, sədaqətə çatar**. (Süleymanın Məsəlləri, 14:22)

**Pislikdən yaxşılığa dönün ki, sağ qalasınız**! Beləcə iddia etdiyiniz kimi Ordular Allahı Rəbb, Həqiqətən, sizə yar olacaq. (Amos, 5:14)

Səylə yaxşılığın ardınca gedən lütf axtarar, Şər ardınca düşən isə başını bəlaya salar. Salehin barı həyat ağacıdır, Hikmətli insan canları qurtarar. Əgər bu dünyada salehlərə belə, cəza verilirsə, Pislərə, günahkarlara gör nə qədər cəza verilər! (Süleymanın Məsəlləri, 11:27, 30)

Qoy şərdən çəkinib yaxşılıq etsin, Sülhü axtarıb ardınca getsin! (Zəbur, 34:14)

Şərdən çəkinib yaxşılıq et ki, Ölkədə əbədi məskən sala biləsən. (Zəbur, 37:27)

Bütün yollarında Onu tanı, O sənin yollarını düzəldər. Öz gözündə özünü hikmətli sanma, Rəbdən qorx, şərdən çəkin. Bu, bədəninə şəfa verər, Sümüklərinə ilik olar. (Süleymanınn Məsəlləri, 3:6-8)

Pisliyə nifrət edin, **yaxşılığı sevin**... (Amos, 5:15)

Qoyma qəlbim şərə meyl etsin, Şər iş görənlərə qoşulub mən də pis iş görməyim... **Saleh insan məni vursa, məhəbbətinə görə tənbeh edər, Bundan imtina etmərəm, sanki başıma çəkilən yağdır**. Daim pislərin şərinə qarşı dua edərəm. (Zəbur, 141:4-5)

Kasıba səxavət göstərən sanki Rəbbə borc verər, **Çünki onun əvəzi Rəbdən gələr** (Süleymanın Məsəlləri, 19:17)

**Saleh adamlara söyləyin ki, Onlara yaxşılıq ediləcək, Çünki onlar xeyirxahlıqlarının bəhrəsini yeyəcək**. Pis adamların vay halına! Çünki onlara pislik olunacaq, Elədikləri əməlləri qarşılarına çıxacaq. (Yeşaya, 3:10-11)

İnsanın sadiqliyi ona xeyir gətirər, Qəddar adam özünə əzab verər. (Süleymanın Məsəlləri, 11:17)



*“O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar.” (Bəqərə surəsi, 4)*

# İNCİLDƏN:

## Allah Təriflənməyə Tək Layiq Olandır, Həmiddir

... **Allahı tərifləyərək, “Ən ucalarda Allaha ucalıq olsun**, yer üzündə Onun məmnun qaldığı insanlara sağlamlıq olsun!” dedilər. (Luka, 2:13-14)

... O hər şeyin üzərində hökm verən, **sonsuza qədər təriflənəcək Allahdır! Amin.** (Romalılara, 9:5)

**Halbuki Allah sonsuza qədər təriflənməyə layiqdir! Amin.**

(Romalılara, 1:25)

Çobanlar, eşidib gördüklərinin hamısı üçün Allahı ucaldıb tərifləyərək geri döndülər. Hər şeyi, özlərinə izah edildiyi kimi tapmışdılar. (Luka, 2:20)

Tərif, ucalıq və müdriklik, təşəkkür və hörmət, güc və qüdrət sonsuzlara qədər Allahımızın olsun. (Vəhy, 7:12)

**Dilimizlə Rəbbi tərifləyərik...** (Yaqub, 3:9)

... O biri xalqlar mərhəməti üçün Allahı ucaltsın. Yazıldığı kimi: “Bunun üçün xalqlar arasında Sənə şükür edəcəyəm, Adını ilahilərlə tərifləyəcəyəm.” Yenə deyilir ki, “Ey xalqlar, Onun xalqıyla birlikdə sevinin!” və **“Ey bütün xalqlar, Rəbbə tariflər söyləyin! Ey bütün xalqlar, Onu ucaldın!”**

(Romalılara, 15:9-11)

... **Allaha təriflər olsun.** (Efeslilərə, 1:3)

... **Mərhəmətli Allaha... təriflər olsun!**

(2 Korinflilərə, 1:3)

## Öldürən və Dirildən Allahdır

**... Amma bu, özümüzə deyil, ölüləri dirildən Allaha güvənməyimiz üçün oldu.** (2 Korinflilərə, 1:9)

**Sizlər, Allahın ölüləri diriltməsini niyə “inanılmaz” görürsünüz?**

(Həvarilərin İşləri, 26:8)

Bədəni öldürə bilən, amma canı öldürə bilməyənlərdən qorxmayın. **Canı da, bədəni də cəhənnəmdə məhvə uğradan Allahdan qorxun.** (Matta, 10:28)

**Hər varlığa həyat verən Allahın...** hüzurunda sənə buyururam.

(1 Timoteyə, 6:13)

... Allah içinizdə yaşayan Ruhuyla ölümlü bədənlərinizə də həyat verəcək.

(Romalılara, 8:11)

“Səni bir çox xalqın atası etdim” deyə yazıldığı kimi İbrahim, iman etdiyi Allahın -ölülərə həyat verən, var olmayanı əmriylə var edən Allahın- Qatında hamımızın atasıdır.

(Romalılara, 4:17)

**Dünyanı və içindəkilərin hamısını yaradan, yerin və göyün Rəbbi olan Allah... Hər kəsə həyat, nəfəs və hər şeyi verən Özü olduğuna görə...**

(Həvarilərin İşləri, 17:24-25)

**Allah necə ölüləri diriltdib onlara həyat verirsə...** (Yəhya 5:21)

## Allahın Ruzi Verən Olması

**...** Göydən çörəyi Musa vermədi. **Sizə göydən gerçək çörəyi verən Rəbbimdir.**

(Yəhya, 6:32)

“Bu səbəblə sizə bunu söyləyirəm: **“Nə yeyib, nə içirik?” deyə canınız üçün,**



*“O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar.” (Bəqərə surəsi, 4)*

**“Nə geyəcəyik?” deyə bədəniniz üçün narahat olmayın.** Can yeməkdən, bədən də geyimdən daha əhəmiyyətli deyilmi? Göydə uçan quşlara baxın! Nə əkər, nə biçər, nə də anbarlarda yemək yığarlar. **Allah yenə də onları doyurar.** Siz onlardan daha qiymətli deyilsinizmi? (Matta, 6:25-26)

[Allah] sizə lütf edir. Göydən yağış yağdırır, müxtəlif məhsullarıyla mövsümləri təşkil edir, sizi yeməklə doyurub ürəklərinizi sevinclə doldurur. (Həvarilərin İşləri, 14:17)

[Allah] nəsillər boyunca Özündən qorxanlara mərhəmət edər... **Ac olanları yaxşılıqlarla doyurdu, zənginləri isə əlləri boş çevirdi.** (Luka, 1:50-53)

İsa şagirdlərinə belə dedi: “Bu səbəblə sizə bunu söyləyirəm: “Nə yeyəcəyik?” deyə canınız üçün, “Nə geyəcəyik?” deyə bədəniniz üçün narahat olmayın... **Qarğalara baxın! Nə əkər, nə biçərlər; nə anbarları vardır. Allah yenə də onları doyurar.** (Luka, 12:22-24)

## Allahın Sevən, Lütfkarlığı Bol Olan, Mərhəmət Edən Olması

**Nəsildən nəslə [Allah] Ondan qorxanlara mərhəmət edər.** (Luka, 1:50)

... **Rəbbin çox acıyan və mehribanlıqla davranan olduğunu bildiniz.** (Yaqub, 5:11)

**Çünki Allahımız mərhəmət doludur. Onun mərhəməti sayəsində,** ucalardan doğan Günəş, qaranlıqda və ölümün kölgəsində yaşayanlara işıq saçmaq və ayaqlarımızı sağlamlıq yoluna yönəltmək üzrə köməyimizə gələcəkdir. (Luka, 1:78-79)

**Amma mərhəməti bol olan Allah bizi çox sevdiyi üçün...** həyata qovuşdurdu. **Onun lütfüylə xilas oldunuz.** (Efeslilərə, 2:4-5)

Çətinliyə qatlana bilənləri xoşbəxt sayarıq. Əyyubun necə dözdüyünü eşitdiniz. **Rəbbin ən sonunda onun üçün nələr etdiyini bilirsiniz. Rəbb çox şəfqətli və mərhəmətlidir.** (Yaqub, 5:11)

**Tam bir müdriklik və anlayışla üzərimizə yağdırdığı lütfünün zənginliyi sayəsində...** qurtuluşa, günahlarımızın bağışlanmasına qovuşduq. (Efeslilərə, 1:7-8)

Biz bilirik ki, hər şey birlikdə Allahı sevənlərin, Onun məqsədinə görə çağırılanların xeyrinə işləyir. (Romalılara, 8:28)

**Amma xilaskarımız Allah yaxşılığını və insana olan sevgisini açıqca göstərərək bizi xilas etdi.** Bunu düzgün etdiyimiz işlərdən ötrü deyil, Öz mərhəmətiylə... **etdi.** (Titə, 3:4-6)

**Allahın sizə bağışladığı fövqəladə lütfdən ötrü sizlər üçün dua edir, sizin üçün darıxırlar. Sözlə izah edilə bilməyən hədiyyəsi üçün Allaha şükürlər olsun!** (2 Korinflilərə, 9:14-15)

**İman yoluyla, lütflə xilas oldunuz. Bu sizin müvəffəqiyyətiniz deyil, Allahın hədiyyəsidir.** Kimsənin öyünməməsi üçün yaxşı işlərin mükafatı deyil. Çünki biz Allahın əsəriyik, Onun əvvəldən hazırladığı yaxşı işləri etmək üzrə... yaradıldıq. (Efeslilərə, 2:8-10)



*"O kəslər ki, sənə göndəriləne (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)*

**Allahın sərhədsiz yaxşılığını, tolerantlığını, səbirini xormu görürsən? [Allahı tənzih edirik.] Onun yaxşılığının səni tövbəyə yönəltdiyini bilmirsənmi?** (Romalılara, 2:4)

Hər kəsin qarşılaşdığı sınaqlardan başqa sınaqlarla qarşılaşmadınız. **Allah etibarlıdır, gücünüzü aşan şəkildə sınanmanıza icazə verməz. Qatlana bilməniz üçün sınaqla birlikdə çıxış yolunu da təmin edəcək.** (1 Korinflilərə, 10:13)

**Sevimli qardaşlarım, Allah bizi bu qədər çox sevdiyinə görə biz də bir-birimizi sevməyə borcluyuq.** (1 Yəhya, 4:11)

Sevimli qardaşlarım, aldanmayın! **Hər nemət, hər mükəmməl hədiyyə... Allahdan gəlir.** (Yaqub, 1:16-17)

Ey gənclər, siz də qocalara qarşı mərhəmətli olun. Hamınız bir-birinizə qarşı təvazökarlıqla davranın. Çünki "Allah qürurlulara qarşıdır, amma təvazökarlara lütf edər." (1 Peter, 5:5)

... Bütün lütfün qaynağı olan Allahın Özü qısa bir müddət acı çəkmənizdən sonra sizi yetkinləşdirib gücləndirəcək, gücləndirib təməlləndirəcək. Qüdrət sonsuzlara qədər Onun olsun! Amin. (1 Peter, 5:10-11)

**Sağlamlıq qaynağı olan Allahın Özü sizi tamamilə mübarək etsin.** Ruhunuz, canınız və bədəniniz... İsa Məsihin gəlişində əksiksiz və qüsursuz olmaq üzrə qorunsun. (1 Saloniklilərə, 5:23)

**Sağlamlıq qaynağı olan Rəbbin Özü sizə hər zaman, hər vəziyyətdə sağlamlıq versin.** Rəbb hamınızla birlikdə olsun. (2 Saloniklilərə, 3:16)

## Allahın Qullarına Nəzarət Edən və Qoruyan Olması

Amma Rəbb etibarlıdır. **O sizi gücləndirəcək, pis olandan qoruyacaq.** (2 Saloniklilərə, 3:3)

Siz onlara bənzəməyin! **Çünki Allahımız nələrə ehtiyac duyduğunu siz daha Ondan diləmədən əvvəl bilir.** (Matta, 6:8)

Bunun üçün, Allahın istəyinə uyğun olaraq acı çəkənlər, yaxşılıq edərək **canlarını etibarlı Yaradana əmanət etsinlər.** (1 Peter, 4:19)

Zaman sona çatarkən ortaya çıxarılmağa hazır olan qurtuluşa qovuşasınız deyə iman **sayəsində Allahın gücüylə qorunursunuz.** (1 Peter, 1:5)

Bu gün var olub, sabah ocağa atılacaq olan çöl otunu belə geydirən Allahın sizi də geydirəcəyi daha qəti deyilmi, ey qıt imanlılar? (Matta, 6:30)

Göydə uçan quşlara baxın! Nə əkər, nə biçər, nə də anbarlarda yemək yığarlar. **Allah yenə də onları doyurar.** Siz onlardan daha qiymətli deyilsinizmi? (Matta, 6:26)

"Elə isə, "Nə yeyəcəyik?" "Nə içəcəyik?" ya da "Nə geyəcəyik?" deyərək narahat olmayın. Xalqlar həmişə bu şeylərin arxasınca qaçar. **Halbuki Allah bütün bunlara ehtiyac duyduğunuzu bilər.** (Matta, 6:31-32)

O günah işləmədi, ağzından hiyləli söz çıxmadı. Ona söyüldüyündə söyüşlə cavab vermədi, acı çəkdiyində kimsəni təhdid etmədi; **davasını, ədalətlə mühakimə edən Allaha buraxdı.** (1 Peter, 2:22-23)

***"Yoxsa onlar: "Onu özündən uydurdu!" - deyirlər? De ki: "Əgər haqlısınızsa, Allahdan başqa bacardığınız kimsələri (köməyə) çağırın və siz də ona bənzər bir surə gətirin!"" (Yunus surəsi, 38)***



# 2 AYƏDƏ BAŞQA 1 AYƏNİN BİRLƏŞMƏSİ:

**NƏML: 26**

**Böyük Ərşin Rəbbi olan Allahdan başqa ilah yoxdur.**

**1) <u>Muminun, 86:</u>**
De: "Yeddi göyün Rəbbi və **əzəmətli Ərşin Rəbbi** kimdir?"

**2) <u>Ali-İmran, 2:</u>**
**Allah, Ondan başqa ilah yoxdur**, *(əbədi)* Yaşayandır, *(bütün yaradılanların)* Qəyyumudur.

**RƏD: 27**

**Kafir olanlar deyirlər: "Niyə ona Rəbbindən bir möcüzə endirilməyib?" De: "Şübhəsiz ki, Allah istədiyini sapdırır.** *(Tövbə edib Ona)* **üz tutan kimsəni isə doğru yola yönəldir".**

**1) <u>Rəd, 7:</u>**
**Kafir olanlar deyirlər: "Niyə ona Rəbbindən bir möcüzə endirilməyib?"** Sən ancaq xəbərdar edənsən. Hər qövmün bir yolgöstərəni vardır.

**2) <u>Fatir, 8:</u>**
Pis əməli özünə gözəl göstərilib onu yaxşı hesab edənlə, *(doğru yolla gedən kimsə eyni ola bilərmi?)* **Həqiqətən, Allah istədiyini zəlalətə salır, istədiyini də doğru yola yönəldir.** Sən onlara görə özünü üzüb əldən salma. Şübhəsiz ki, Allah onların nə törətdiklərini bilir.

*“Bu (Quran), aləmlər üçün ancaq bir öyüddür! Siz onun verdiyi xəbəri bir müddət sonra mütləq biləcəksiniz.” (Sad surəsi 87-88)*



# 3 AYƏDƏ BAŞQA 1 AYƏNİN BİRLƏŞMƏSİ:

**DUXAN: 8**

**Ondan başqa** *(ibadətə layiq olan)* **məbud yoxdur. O həm diriltdir, həm də öldürür. O həm sizin Rəbbiniz, həm də əcdadlarınızın Rəbbidir.**

**1) ƏNAM, 102:**
Budur Allah – sizin Rəbbiniz. **Ondan başqa ilah yoxdur.** Hər şeyin Yaradıcısı *(Allahdır)*! Elə isə Ona ibadət edin! O, hər şeyi Qoruyandır.

**2) HƏDİD, 2:**
Göylərin və yerin hökmranlığı Ona məxsusdur. **O həm diriltdir, həm də öldürür.** O, hər şeyə qadirdir.

**3) ŞUƏRA, 26:**
*(Musa)* dedi: “**O sizin də, ulu babalarınızın da Rəbbidir!**”

**ƏHQAF: 14**

**Onlar Cənnət əhlidirlər və etdikləri əməllərin əvəzi olaraq orada əbədi qalacaqlar.**

**1) ƏRAF, 42:**
İman gətirib yaxşı əməl edənlər isə **Cənnət sakinləridir**-. Onlar orada əbədi qalacaqlar. Biz hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər yükləyirik.

**2) VAQİƏ, 24:**
*(Bu,)* onların **etdikləri əməllərin mükafatı olacaq.**

**3) TƏĞABUN, 10:**
İnkar edən və ayələrimizi yalanlayanlar cəhənnəm əhlidirlər. Onlar **orada əbədi qalacaqlar.** Ora necə də pis bir dönüş yeridir!

# HAQQI YILMAZIN ARAŞDIRMALARINA ƏSASƏN QURANDAKI BƏZİ SÖZLƏRİN MƏNALARI

**Yay uzunluğu** – Ayədə işlədilən o dövrdə istifadə edilən və o dövrün adamlarının bildiyi bir uzunluq ölçüsüdür. "Metr" kimi beynəlxalq səviyyədə qəbul edilən ölçülər olmadığından, regional ölçülərdə istifadə edilirdi. "Yay boyu" da o dövrdə işlədilən rumh [nizə], sövt [dəyənək], arşın, qulac, boy, isbi [barmaq], xətvə [addım], şibr [qarış], zira [qol], ox atımı kimi ölçü vahidi idi. Belə ölçü vahidləri o dövrdə Qərb ölkələrində də var idi. Məsələn insan ayağının ölçüsünü əsas götürən "feet", insan əlinin baş barmağının dırnaq dibinin genişliyini əsas götürən "inch" kimi ölçülər Qərbdə işlədilən ölçü vahidləri idi. Yəni Uca Allah öz mesajında, xitab etdiyi camaatın bildiyi bir ölçü vahidini işlətmişdir.

**Vəhy** – Ayədə keçən *vəhy* sözünün ilk mənası "gizli bir şəkildə məlumat vermək"dir. Daha sonra zaman keçdikcə, bu mənanın ətrafında "gizli danışıq, işarət etmək, əmr vermək, ilham vermək, ima etmək, pıçıldamaq, məktub yazmaq, elçi göndərmək" mənalarında da işlədilmişdir. *Vəhy* sözünün bir termin kimi mənası isə belədir: "Allahın Öz əmrlərini, hökmlərini bir vasitə və vasitəçi olmadan, gizli və sürətli bir şəkildə peyğəmbərlərinə bildirməsi". *Vəhy* sözü *ilqa* sözü ilə eyni mənada işlədilir.

Vəhyin necə meydana gəldiyini bilmirik, bilməyimiz mümkün də deyil. Çünki Allah, yoxdan var etmək kimi, bu işi də "Öz işlərindən biri; başqa heç kimin eləyə bilmədiyi, eləməsi mümkün olmayan bir iş" kimi tərif etmişdir.

**Lat, Uzza, Mənat** – Lat, Uzza, Mənat adlarının quruluşu və mənası haqqında geniş izahat vermək mümkündür. Ancaq biz, hər üçü müənnəs [qadın cinsində] olan bu adlar barədə ensiklopedik səviyyədə məlumat verməklə təfərrüata varmayacağıq. Bu adların müənnəs olmasının səbəbi, ərəblərin bunlar mələklər olaraq, mələkləri isə Allahın qızları olaraq qəbul etməsidir.

Lat Taif şəhərində, qapısında gözətçilər və xidmətçilər olan bir binanın içindəki ağ, işlənmiş, üstü örtülü bir qaya idi. Taif əhalisi [Saqif qəbiləsi] Kəbədən sonra ən mötəbər məbədin Lat olduğuna inanırdı və Qureyşdən başqa digər qəbilələr qarşısında bununla öyünürdü.

Uzza Məkkə ilə Taif arasında Naxlə deyilən yerdə, bir binanın içindəki ağac idi. Bunun daş olduğu da rəvayət edilir. Qureyş qəbiləsinin ehtiram bəslədiyi bu şeyin üstü örtülü idi. Bu gün belə Kəbənin üstünün örtülməsi, cahiliyyə dövrünə məxsus bu adətin davam etdiyini fikirləşməyimiz üçün bir əsas ola bilər.

Mənat Məkkə ilə Mədinə arasında Müşəlləl deyilən yerdə bir qaya [heykəl] idi. Huzaa, Övs və Xəzrəc qəbilələri bu heykəl-qayaya ehtiram bəsləyir, həccə buradan başlayır və bu qayanın önündə yağmur duasına çıxırdılar.

Müşriklər, müqəddəs saydıqları bu bütlərə and içir, uşaqlarına Abdullat [Latın qulu], Abduluzza [Uzzanın qulu] və Abdulmənat [Mənatın qulu] kimi adlar verirdilər.

Bunların xaricində də müxtəlif qəbilələrə məxsus, öz gözətçiləri və xidmətçiləri olan bir çox büt və məbəd var idi. Kəbə üçün qurban kəsdikləri kimi, onlara da qurban kəsirdilər. Ayədə məxsusi olaraq bu üç bütün adının çəkilməsinin səbəbi, Hicaz tərəflərində çox sayda insanın ortaq tapındıqları bütlər olmasıdır.

**Mələklər** – Xəbərçi ayələr, Təbiətdəki Güclər, təbii güclər; zorakılar, zorakı rejimlər, tapşırıq almış qüvvələr.

*Məlaikə* və tək halı olan *mələk* sözü həm "elçi göndərmək" mənasına gələn *uluk* sözündən, həm də "qüvvət, idarə gücü" mənasına gələn *məlk* sözündən əmələ gəlmiş ola bilər. "Elçi göndərmək" mənasına gələn *uluk* sözündən əmələ gələn *mələk* və *məlaikə* sözləri "peyğəmbərləri, vəhy ayələrini" ifadə edir. *Məlk* kökündən əmələ gələn *mələk*

və *məlaikə* sözləri isə “təbiətdəki bütün maddi gücləri və enerji güclərini” ifadə edir. Quranda işlədilən bu sözlərin hər iki kökdən əmələ gəldiyini və əmələ gəldiyi kökün mənasına görə müxtəlif mənalarda işlədildiyini müəyyənləşdirdik. Yəni *məlaikə* sözü Quranda bəzən birinci, bəzən də ikinci mənada işlənmişdir. Hansı mənaya gəldiyini, işlədildiyi cümlənin və abzasın ümumi mənasına baxaraq müəyyən etmək mümkündür. “Təbyinül-Quran”da *mələk* sözü ətraflı izah edilmişdir.

*(Fatir surəsinin 1-ci ayəsindəki iki-iki, üç -üç, dörd-dörd qanadlı mələklər haqqında)*

Yuxarıda da deyildiyi kimi, *mələk* sözü, əmələ gəldiyi kökə görə müxtəlif mənalar verməkdədir. *Məlaikə* və bu sözün tək halı olan *mələk* sözü *uluk* yaxud *məlk* köklərindən əmələ gəlmişdir. Ona görə də *məlaikə* sözü bəzən “elçi”, bəzən də “idarə etmək gücü” mənalarını verir. Sözün hansı mənada işləndiyi, onun yer aldığı mətnin məzmununa görə anlaşılmaqdadır.

İki-iki, üç-üç, dörd-dörd qanadlı: Cahiliyyət dövründə yaşayan ərəblərin inanışına görə Allahın qızları və köməkçiləri olan mələklər, qanadlı məxluqlardır. Külək, yağış, zəlzələ kimi təbiət hadisələri də mələklərin əsəridir. Cahiliyyət dövrünə məxsus olan bu inanışlar qismən rəvayətlərə də daxil olmuşdur və Cəbrailin 600 qanadı olduğunun Peyğəmbərimiz tərəfindən rəvayət etdiyi iddia olunmuşdur. İsrafilin isə hər biri şərqdən qərbə qədər uzanan 12 min ədəd qanadının olduğu, Allah ərşini bu qanadların üstündə saxladığı da rəvayətlərə əlavə edilmişdir. Bəzi rəvayətlərdə isə mələklərin qanadlarının sayı milyonları keçməkdədir.

Qənaətimizcə, *qanad* sözü burada “güc”ü ifadə etmək məqsədi ilə işlədilmişdir. Belə ki, bu qanadlar bir növ fizikadakı gücün ölçü vahidi olan “at gücü” ifadəsinin yerini tutmaqdadır. Mələklərin qanadlarının çoxluğu, onların güclərinin də artıq olduğunu ifadə etməkdədir. O halda, əgər *mələk* sözü “idarə gücü” mənasında işlədilibsə, *mələklərin qanadları* da “yağış, külək, sel kimi təbiət hadisələrinin gücünü”; *mələk* sözü “elçi” mənasında işlədilibsə, *mələklərin qanadları* “Quran ayələrinin mütəşabeh mənalarının insanlarda yaratdığı təsir” kimi başa düşülməlidir. Bu izahdan sonra, mövzumuz olan ayələr, sözlərin fərqli mənalarına baxılaraq iki cür dəyərləndirilə bilər:

A) *“Bütün təriflər, göyləri və yeri yoxdan yaradan, xəbərçi ayələri iki-iki, üç-üç, dörd-dörd mənalar daşıyan elçilər olaraq göndərən Allaha məxsusdur. O, əmələ gətirməkdə, istədiyini artırar. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.”*

B) *“Bütün təriflər, göyləri və yeri yarıb parçalayacaq olan, təbiət qüvvələrini müxtəlif şiddət vahidinə sahib elçilər olaraq göndərən Allaha məxsusdur. O, əmələ gətirməkdə, istədiyini artırar. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.”*

Bu ayədə mələklərin *iki-iki, üç-üç, dörd-dörd qanadlı elçilər* olduğunun deyilməsi haqqındakı izahımız isə belədir ki, bu sözlərlə, mütəşabeh ayələrin birdən çox məna ifadə etdikləri bildirilmişdir. İkinci ayədəki *rəhmət* və *həkim* sözləri, belə bir məna çıxarmağın mümkün olduğuna işarədir.

Ayənin axırındakı *Allah… artırar* ibarəsi “Allahın gücünün sərhədsiz olduğunu, istədiyi hər şeyi yarada bildiyini və yaratmaqda davam etdiyini” ifadə etməkdədir.

**NÖVBƏTİ SERİYADA ARDI VAR...**

# ALLAHI İSİMLƏRİ İLƏ TANIYAQ



## CAMİ

### İstədiyini, istədiyi zaman, istədiyi yerdə toplayan

**Ey Rəbbimiz! Olacağına şübhə edilməyən bir gündə bütün insanları toplayan Sənsən. Allah Öz vədəsindən əsla dönməz!** (Ali-İmran surəsi, 9)

Dağınıq şeylərin bir yerə toplanması mənasını verən "cəm" sözü Allahın bütün kainatdakı sistemlər üzərində hakimiyyətini göstərən sifətini ifadə edir. Kainatı və içindəkiləri yaradan Allah canlı və cansız bütün varlıqlara dilədiyini etdirmə, istədiyi yerdə və istədiyi şəkildə toplama qüdrətinə malikdir. Quranda Allah dünyada möminləri bir yerə yığacağını belə vəd etmişdir:

**Hər kəsin üz tutduğu bir qibləsi vardır. Yaxşı işlər görməkdə bir-birinizi ötməyə çalışın! Harada olursunuzsa olun, Allah sizi bir yerə toplayacaqdır. Həqiqətən, Allah hər şeyə qadirdir!** (Bəqərə surəsi, 148)

Ancaq həqiqi toplanma günü qiyamətlə reallaşacaq. Özünə şübhə olunmayan qiyamət günündə Allahın bütün qulları Onun hüzurunda toplanacaqlar. Dünyada Özünü və elçilərini yalanlayanların inkarlarını və bu inkarlarından qaynaqlanan bütün hərəkətlərini bilən Allah, elçiləri ilə bütün insanlığa xəbər verdiyi böyük hesab günündə gəlmiş-keçmiş bütün cəmiyyətləri bir yerə yığacaq. Sura üfürüldüyü gün günahkarların hamısı bir yerə yığılacaq və etdiklərindən hesaba çəkiləcəklər. İnkar edənlər üzüaşağı cəhənnəmə sürüklənəcək, layiq olduqları cəzanı yenə yoldaşları ilə birlikdə alacaqlar.

Allah Özünə iman edənləri isə etdiklərinə qarşılıq olaraq cənnətdə də -dünyada olduğu kimi- birlikdə mükafatlandıracaq. Allah təqva sahiblərini də rəhbərləri ilə birlikdə hüzuruna gətirəcək. Onlar nurları önlərində və yanlarında Allahın izni və rəhməti ilə cənnətə girəcəklər. Özünü inkar edən insanları isə dünyada da bir-birlərinə dəstək olub qruplaşdıqları kimi, cəhənnəmdə də həmişə bir yerdə saxlayacaq, bir-birləri ilə dalaşıb mübahisə etmələrinə izn verəcək. Zülm edənlərin yoldaşları və ibadət etdikləri həmişə bir yerdə olacaqlar, işlədikləri günahların cəzasını cəhənnəmdə həmişə birlikdə çəkəcəklər. Çox arxalandıqları yoldaşları və dostları ilə birlikdə cəhənnəmə sürüklənmənin əzabını yaşayacaqlar. Allah dünyada şeytana itaət edən insanları axirətdə bir yerə yığaraq cəhənnəmə atacağını aşağıdakı ayəsi ilə bildirmişdir:

**Allah kitabda sizə nazil etmişdir ki, "Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman müşriklər başqa bir söhbətə girişməyənə qədər onlarla bir yerdə əyləşməyin! Çünki o vaxt siz də onların tayı" olarsınız. Həqiqətən, Allah münafiqlərin və kafirlərin hamısını cəhənnəmdə bir yerdə toplayacaqdır!** (Nisa surəsi, 140)

**De: "Rəbbimiz hamımızı bir araya cəmləşdirib sonra da aramızda ədalətlə hökm verəcəkdir. O, ən ədalətli Hakimdir, biləndir"** (Səba surəsi, 26)

**"Ey Rəbbimiz! Həqiqətən, şübhə edilməyən bir gündə insanları Sən yığacaqsan. Həqiqətən, Allah vədinə xilaf çıxmaz!" Kafir olanların nə malları, nə də övladları onlara Allahın dərgahında heç bir şeylə fayda verə bilməz. Onlar cəhənnəmin yanacağıdırlar.** (Ali-İmran surəsi, 9-10)

# CABBAR

## Dilədiyini zorla etdirməyə qadir olan

**O Allah ki, Ondan başqa ilah yoxdur. Məlikdir; Qüddusdur; Salamdır; Mömindir; Müheymindir; Əzizdir; Cabbardır; Mütəkəbbirdir. Allah,** *(müşriklərin)* **şirk qoşduqlarından çox Ucadır.** (Həşr surəsi, 23)

Allaha qarşı böyüklənməyin, Ona təslim olmamağın arxasında insanın özünü Allahdan müstəqil varlıq olaraq görüb, sahib olduğu bəzi xüsusiyyətlərin özündən qaynaqlandığını zənn etməsi, buna görə də özünə "mənlik" verməsi dayanır. Halbuki, bu, səhv məntiqdir. İnsan bir az düşünsə, bu dünyaya öz iradəsi ilə gəlmədiyini, həyatının nə vaxt sona çatacağını bilmədiyini, sahib olduğu fiziki xüsusiyyətlərin öz seçimi ilə özünə verilmədiyini rahatlıqla görə bilər. Öz bədəni də daxil olmaqla, sahib olduğu hər şeyin keçici olduğunu və sonunda yox olacağını anlayar. Bütün bunlar insanın tamamilə aciz olduğunun, heç nəyin özünə aid və öz idarəsi daxilində olmadığının açıq dəlilləridir. Əgər bir az daha düşünsə, bu dəlillərin saysız-hesabsız olduğunu görə bilər.

İnsanın bütün bu gerçəklər qarşısında özünü yaradan Rəbbinə qarşı böyüklənməyə cəhd etməsinin nə qədər ağılsız hərəkət olduğu aşkardır. Halbuki, insan Allahın böyüklüyünü, hər şeyi yoxdan yaratdığını, insanların sahib olduqları bütün imkan və xüsusiyyətləri verənin Allah olduğunu, dilədiyi anda da hamısını geri ala biləcəyini, bütün canlıların ölümlü olduğunu, tək baqi olanın Allah olduğunu qəbul edib, gerçək sahibinə təslim olmalıdır. Çünki Allah Özünə qarşı haqsız yerə böyüklənən, acizliyini bilməyən və üz çevirən hər kəsə dilədiyi zaman məcburən boyun əydirməyə qadir olandır.

Quranda sahib olduğu şeylərdən ötəri qürurlanan və sonunda da Allahın Cabbar sifəti ilə acizliklərini görən və səhvlərini qəbul edən bağça sahiblərinin vəziyyəti ibrət olaraq izah edilmişdir. Sabahısı gün bağçalarını erkəndən yığacaqlarına dair and içən bağça sahiblərinin başlarına gələnlər belə bildirilmişdir:

**... Onlar yuxuda ikən sənin Rəbbindən o bağa bir bəla gəldi. Və o,** *(yanıb)* **qapqara qaraldı.** (Qələm surəsi, 19-20)

*(Bağı)* **bu vəziyyətdə gördükdə dedilər: "Yəqin ki, azmışıq! Xeyr, biz məhrum olmuşuq!"**
**Onların ən ağıllısı dedi: "Məgər mən sizə** *(Allahı)* **həmd-səna ilə təqdis etməli olduğunuzu demədimmi?!" Onlar: "Rəbbimiz pakdır, müqəddəsdir! Həqiqətən, biz zalım idik!"–dedilər. Onlar bir-birini danlamağa başladılar. Və dedilər: "Vay halımıza! Biz azğınlıq edirdik." "Ola bilsin ki, Rəbbimiz onun əvəzinə bizə daha yaxşısını versin. Biz Rəbbimizdən** *(bizi bağışlamasını)* **diləyirik!"**
**Əzab belədir. Şübhəsiz ki, axirət əzabı daha şiddətlidir. Kaş biləydilər!**
(Qələm surəsi, 26-33)

**Biz cəhənnəm üçün bir çox cinlər və insanlar yaratdıq. Onların qəlbləri var, onunla anlamazlar; gözləri var, onunla görməzlər; qulaqları var, onunla eşitməzlər. Onlar heyvan kimidirlər, hətta daha çox azğınlıqdadırlar. Qafil olanlar da məhz onlardır.**
(Əraf surəsi, 179)

# DAİ

## Çağıran, Dəvət edən

**Ey iman gətirənlər! Peyğəmbər sizi sizləri dirildəcək bir şeyə dəvət etdiyi zaman Allahın və Onun Peyğəmbərinin dəvətini qəbul edin. Bilin ki, Allah insanla onun qəlbi arasına girər və siz axırda Onun hüzuruna cəm ediləcəksiniz!** (Ənfal surəsi, 24)

İnsan həmişə ən doğru olanı düşündüyünü, həyatı ilə əlaqədar ən məqsədəuyğun qərarları özünün qəbul etdiyini zənn edir. Özünə görə təyin etdiyi bəzi qaydalar var; əgər o qaydalar

çərçivəsində bir həyat yaşasa, özü üçün ən yaxşı olanı təmin etmiş olacağını düşünür. Halbuki, bu, bir çox insanın yaşadığı səhv düşüncə tərzidir.

İnsanı Allah yaradıb və ona şahdamarından daha yaxındır. İnsan bəzən özü ilə əlaqədar olan bir çox mövzunu bilmir, amma insan özü ilə əlaqədar olan məlumatlardan xəbərsiz ikən Allah bunların hamısını bilir. Çünki onun daxilinə, xaricinə, düşüncələrinə, şüur altına tamamilə hakimdir. Hətta insan bir an sonra nə ilə qarşılaşacağını bilmir və ya keçmişdə qarşılaşdığı bəzi hadisələri unuda bilər. Amma Allah unutmur və yanılmır. İnsanın keçmişdə yaşadığı və gələcəkdə yaşayacağı hər hadisəyə də hakimdir. Buna görə, insan üçün ən xeyirli olanı bilən ancaq onu yaradan və həyatda yaşadığı hər anın məlumatına sahib olan Allahdır.

Necə ki, Quranda **"...Bəzən xoşlamadığınız bir şey sizin üçün xeyirli, bəzən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər. Allah bilir, siz bilməzsiniz"** (Bəqərə surəsi, 216) ayəsi ilə bu həqiqətə açıq-aşkar diqqət çəkilmişdir.

Buna görə, insanın vəzifəsi Allahın özünə bildirdiyi, dəvət etdiyi haqq yola, yəni özünə həyat verəcək şeylərə təslim olmaqdır. Allah bu doğru yolu Peyğəmbərimizə (s) vəhy etdiyi Quran vasitəsilə insanlara bildirmişdir. Hamının həyatı boyunca nə etməli olduğu, necə həyat yaşamalı olduğu, necə hərəkət etdikdə qurtulacağı Allahın ayələri ilə bir-bir bildirilmişdir.

## DAFİQ

### Bəlaları dəf edən, Uzaqlaşdıran

**Nəhayət, onlar Allahın izni ilə Calutu və qoşununu məğlub etdilər. Davud Calutu öldürdü. Allah Davuda həm hökmranlıq, həm də hikmət verdi və ona istədiyini öyrətdi. Əgər Allah insanların bir qismini, digər bir qismi ilə dəf etməsə idi, yer üzü fitnə-fəsada uğrayardı. Lakin Allah bütün aləmlərə qarşı lütfkardır.** (Bəqərə surəsi, 251)

Möminləri maddi-mənəvi hər cür təhlükədən qoruyan Allah onlara kafirlərə, münafiqlərə, müşriklərə qarşı da böyük bir qüvvət, məğlub edilməz güc verir. İnkar edənlər hazırladıqları hiyləgər tələlərin, təşkil etdikləri sui-qəsd və hücumların hələ planlarını qurarkən Allah onlar üçün başqa bir tələ qurur. Beləliklə, vermək istədikləri zərəri möminlərdən dəf edərək tələlərini öz başlarına keçirər.

Digər tərəfdən, Allah inkarçıları öz aralarında da ayrılığa salaraq, bir-birləri ilə mübarizə etdirir və bu şəkildə gücdən salır. Müsəlmanlara kin saxlayanları onlardan uzaq saxlayır, öz canlarının dərdinə düşəcək bəlalar göndərir. Bu ilahi kömək Quranda belə bildirilmişdir:

**O kəslər ki, haqsız yerə, ancaq: "Rəbbimiz Allahdır", dediklərinə görə yurdlarından çıxarıldılar. Əgər Allah insanların bir qismini digər qismi ilə dəf etməsəydi, sözsüz ki, içərisində Allahın adı çox zikr olunan sovməələr, kilsələr, məbədlər və məscidlər dağılıb gedərdi. Allah Ona yardım edənlərə, şübhəsiz ki, yardım edər…**

(Həcc surəsi, 40)

Bununla yanaşı, bir çox çətinliyi, xəstəliyi, vəsvəsəni, şeytanın şərini və bəlasını da möminlərin üzərindən dəf edən və daha bilmədikləri nə qədər müsibəti onlardan geri çevirən yalnız Allahdır. Şübhəsiz, bunların hər biri Allahın möminlərə gizli və açıq şəkildə göstərdiyi köməkləridir. O, qullarına qarşı çox şəfqətli, Özünə sığınanlara, Özündən kömək istəyənlərə qarşı da əsirgəyənlərin ən xeyirlisidir.

**Onlar ildə bir və ya iki dəfə fəlakətə uğradıqlarını görmürlərmi? Yenə də tövbə etmir, ibrət almırlar.**

(Tövbə surəsi, 126)

**Yaxud onlar Allahın hiyləsindən ehtiyat etmirdilərmi? Allahın hiyləsindən yalnız ziyana uğrayanlar ehtiyat etməzlər. Məgər yer üzünün sakinlərindən sonra ona varis olanlara bəyan olmadımı ki, əgər Biz istəsəydik,**

**onları da günahları üzündən müsibətə düçar edər, qəlblərinə möhür vurardıq və onlar da eşitməzdilər? Bu, o ölkələrdir ki, onların əhvalatlarından bəzisini sənə söyləyirik. Elçiləri onlara açıq-aydın dəlillər gətirdilər. Onlar isə daha öncə yalan hesab etdiklərinə görə iman gətirmədirlər. Allah kafirlərin qəlblərini beləcə möhürləyir.**

(Əraf surəsi, 99-101)

**Bir zaman kafirlər səni həbs etmək, öldürmək və ya qovmaq üçün sənə qarşı hiylə qururdular. Onlar hiylə işlətdilər, Allah da hiylə işlətdi. Allah hiylə işlədənlərin ən yaxşısıdır.**

(Ənfal surəsi, 30)

## ƏRHAMÜR-RAHİMİN

### Mərhəmət edənlərin ən mərhəmətlisi

**Əyyubu da** *(yada sal)***! Bir vaxt o, Rəbbinə yalvarıb dua edərək belə demişdi: "Mənə bəla üz verdi. Sən rəhmlilərin rəhmlisisən!"**

(Ənbiya surəsi, 83)

Yer üzündəki bütün canlılar kimi insan da ehtiyacları olan varlıqdır. Həyatının davam etməsi üçün çoxlu şərt vardır. Nəfəs almaq üçün oksigenə, bədəninin fəaliyyətlərini davam etdirmək üçün su və qidaya ehtiyacı olur. Əslində, bu nümunələri saymaqla bitirmək olmaz. Çünki insanın fiziki olaraq varlığının davam etməsi üçün saysız detala ehtiyacı var.

Ancaq yer üzündəki bütün insanlar ehtiyacları olan şeyləri əldə etmək üçün çox böyük səy göstərmədən həyatlarını rahat şəkildə davam etdirirlər. Hər birinin həm bədənlərində, həm də xarici dünyada ehtiyacları olan hər şey onlar üçün əvvəldən təyin olunmuş və onlara təqdim edilmişdir. Burada ilk ağıla gələn nümunə yenə insanın nəfəs almasıdır. İnsanlar həyatlarını davam etdirmək üçün oksigen qəbul etməlidirlər. Bəs bu oksigenin atmosferdə lazım olan nisbətlərdə olmasını təmin edən kimdir? İnsanın bədəninə bu oksigeni qəbul etdirən və lazım olan hər hüceyrəyə bir-bir çatmasını təmin edən sistemi quran kimdir?

Əlbəttə, bunların heç biri insanın müvəffəqiyyəti deyil. Atmosferin və ya öz tənəffüs sisteminin meydana gəlməsində insanın heç bir rolu yoxdur.

İnsanın bu ən həyati ehtiyacından tutmuş bütün detallar özü üçün hazırlanmış və lazım olduğu şəkildə var edilmişdir. Şübhəsiz, burada qarşımıza hər cür detalı insan üçün hazırlayan üstün ağılın varlığı və o ağılın sahibinin insana göstərdiyi sonsuz mərhəməti çıxır. Bu gücün sahibi isə mərhəmətlilərin ən mərhəmətlisi olan Allahdır.

Allahın mərhəməti, əlbəttə ki, insanların fiziki ehtiyaclarının qarşılanması ilə məhdud deyil. O, insanları yaratmış, yaşamaları üçün ən əlverişli olan məkana yerləşdirmiş və bunun qarşılığında da yalnız Özünə qulluq etmələrini istəmişdir. İnsanlara Özünü necə razı edəcəklərini də bildirmiş, bunu öyrətmək üçün onlara dərgahından kitablar endirmiş, bütün ayələrini açıqlayan peyğəmbərlər göndərmişdir. Beləliklə, Allah insanlara həm Öz Şəxsini tanıtmış, həm də onları dinə və gözəl əxlaqa dəvət etmişdir. Şübhəsiz, bunların hamısı Rəbbimizin sonsuz mərhəmətinin açıq dəlillərindəndir.

**Dedi: "Bu gün siz qınanılmayacaqsınız. Allah sizi bağışlasın! O, rəhm edənlərin ən rəhmlisidir."** (Yusif surəsi, 92)

**Əyyubu da** *(yada sal!)* **Bir zaman o, Rəbbinə yalvarıb demişdi: "Mənə, həqiqətən də bəla düçar olubdur. Sən rəhmlilərin ən rəhmlisisən!" Biz onun duasını qəbul etdik və ona düçar olmuş bəlanı aradan qaldırdıq. Öz tərəfimizdən bir mərhəmət və ibadət edənlərə bir ibrət olsun deyə, ailəsini ona qaytardıq, üstəlik, bir o qədər də əlavə etdik.** (Ənbiya surəsi, 83-84)

**Rəbbiniz sizi çox yaxşı tanıyır. İstəsə, sizə rəhm edər, istəsə, sizə əzab verər. Biz səni onlara vəkil göndərməmişik.** (İsra surəsi, 54)